QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

*Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram.*
*Heydər ƏLİYEV*

Aprel 2019
№ 04 (1101)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ




## Akademik Məmməd Cəfər Cəfərovun 110 illiyinin qeyd edilməsi haqqında
### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2019-cu ilin may ayında görkəmli ədəbiyyatşünas və tənqidçi, Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycanın Dövlət mükafatı laureatı, Əməkdar elm xadimi, filologiya elmləri doktoru, professor Məmməd Cəfər Zeynalabdin oğlu Cəfərovun anadan olmasının 110 illiyi tamam olur.

Akademik Məmməd Cəfər Cəfərov ömrünün 60 ilə yaxın bir dövrünü ölkədə ədəbi-nəzəri fikrin inkişafına həsr etmiş, ədəbiyyatın tarixi və nəzəriyyəsi, ədəbi əlaqələr və eləcə də estetikanın aktual məsələlərinə dair fundamental araşdırmaları ilə Azərbaycan ədəbiyyatşünaslığını əhəmiyyətli dərəcədə zənginləşdirmişdir. Onun geniş əhatəli elmi irsində Nizami Gəncəvi, Məhəmməd Füzuli, Mirzə Fətəli Axundzadə, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Hüseyn Cavid və Səməd Vurğun kimi qüdrətli söz ustalarının yaradıcılıqlarının fəlsəfi-estetik mahiyyətini dünya ədəbi təcrübəsi ilə vəhdətdə dolğun şərh edən, yüksək elmi-nəzəri ümumiləşdirmə gücünə malik əsərləri xüsusi yer tutur. Azərbaycan ədəbiyyatında romantizm cərəyanının təşəkkülü və inkişafının ilk müfəssəl tədqiqi Məmməd Cəfər Cəfərovun adı ilə bağlıdır. Pedaqoji sahədə uzun müddət uğurla çalışan və qiymətli dərsliklər müəllifi olan alim, həmçinin elmi kadrların hazırlanması istiqamətində təqdirəlayiq fəaliyyət göstərmişdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan ədəbiyyatşünaslığına yeni yaradıcılıq keyfiyyətləri qazandırmış görkəmli alim Məmməd Cəfər Cəfərovun anadan olmasının 110-cu ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Milli Elmlər Akademiyası Azərbaycan Respublikasının Təhsil Nazirliyi ilə birlikdə akademik Məmməd Cəfər Cəfərovun 110 illiyinə dair tədbirlər planını hazırlayıb həyata keçirsin.
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 15 aprel 2019-cu il*

## Vətənpərvərliklə bağlı tədbir

Aprelin 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Səbail Rayon İcra Hakimiyyətinin (RİH) və "Xocalı Soyqırımını Tanıtma" İctimai Birliyinin birgə təşkilaçılığı ilə 31Mart-Azərbaycanlıların Soyqırımı Günü, Kəlbəcər rayonunun işğalının 26-cı ildönümü və Aprel döyüşlərinin 3 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Səbail RİH-in məsul şəxsləri, Qarabağ müharibəsi iştirakçıları, hərbçilər, tanınmış və nüfuzlu ziyalılar, müəllim və tələbələr iştirak ediblər. Öncə iştirakçılar uşaq, yeniyetmə və gənclərin soyqırımı mövzusunda əl işlərindən ibarət sərgi ilə tanış olublar, sonra tədbir universitetin Böyük Akt zalında davam edib. Əvvəlcə şəhid soydaşlarımızın xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Azərbaycanın Dövlət Himni səsləndirilib.



Tədbiri giriş sözü ilə açan "Xocalı Soyqırımını Tanıtma" İctimai Birliyinin sədri, "Ana harayı" qəzetinin baş redaktoru, Qarabağ müharibəsi veteranı Şamil Sabiroğlu tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun və Səbail RİH-in rəhbərliyinə təşəkkür edib. Qeyd edib ki, ermənilər 200 ildən çoxdur ki, Azərbaycan xalqına qarşı soyqırımı siyasəti həyata keçirirlər. Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi bu soyqırımı siyasətinin tərkib hissəsidir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müdrik və uzaqgörən siyasəti nəticəsində torpaqlarımız erməni işğalından azad ediləcəkdir. Şanlı Aprel qələbəsi Azərbaycan Silahlı Qüvvələrinin gücünü, qüdrətini bir daha sübut etdi.

ADPU-nun Tarix və coğrafiya fakültəsinin Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov "Keçmişdən bu günə" mövzusunda məruzə ilə çıxış edib. Professor M. Əmrahovun maraqlı və məzmunlu məruzəsində tariximizin tam və hərtərəfli öyrənilməsi, həmçinin ulu öndər Heydər Əliyevin ermənilərin xalqımıza qarşı törətdikləri soyqırımlarına verdiyi siyasi-hüquqi qiymət xüsusi vurğulanıb.

Tanınmış ziyalı, "Azərnəşr"in baş redaktoru, Əməkdar jurnalist Əlövsət Ağalarov, Azərbaycanın Milli Qəhrəmanı Şahlar Şükürovun bacısı, Bakı şəhərinin Nərimanov rayonundakı Azərbaycanın Milli Qəhrəmanı Rafiq Nəsrəddinov adına 39 nömrəli tam orta məktəbin direktoru Tahirə Şükürova, "Azərbaycan Bayrağı" ordenli Ülfət Kərimovun bacısı Xuraman xanım, Azərbaycanın Milli Qəhrəmanı Asif Məhərrəmov adına İnkişaf Fondunun sədri Ədalət Məhərrəmov, Aprel döyüşlərinin iştirakçısı Anar Məmmədov, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının baş katibi Ramin Həbibzadə və başqaları çıxış edərək tədbirin keçirilməsini yüksək qiymətləndiriblər və tələbə-gənclərə milli ruhlu, vətənpərvər olmağı tövsiyə ediblər.



Tədbirdə vətənpərvərlik mövzusunda mahnılar, şeirlər səsləndirilib.

**Mənsur İbrahimli**

## Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Aprel döyüşlərinə həsr olunmuş tədbiri

Aprelin 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsi Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatı ilə birgə Aprel döyüşlərinə həsr olunmuş tədbir keçirib. Tədbirdə Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının sədri, ehtiyatda olan general-polkovnik Tofiq Ağahüseynov, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Aprel döyüşlərində qəhrəmancasına şəhid olmuş polkovnik-leytenant Sənan Axundovun həyat yoldaşı Nəcibə Axundova, müharibə veteranları, universitetin müəllimləri və tələbələri iştirak edibşlər. Qeyd edək ki, tədbirin keçirilməsində əsas məqsəd gənclər arasında vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi, Azərbaycanın ərazi bütövlüyünün qorunması yolunda canından keçmiş, Vətən, xalq qarşısında əvəzsiz xidmətləri olan şəhidlərimizin tanıdılması, gənc nəslə onların həyat və fəaliyyətlərinin örnək olaraq təbliğ edilməsidir.





ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının rəhbərliyinə bu cür tədbirlərin təşkilinə görə təşəkkür edib. Gənclərin üzərinə düşən məsuliyyətdən və rəhbərlik etdiyi universitetin gənclərinin təhsildə əldə etdiyi uğurlara nəzər salıb, Azərbaycanın gələcəyinin əmin əllərdə olmasını vurğulayıb.

Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının sədr müavini, polkovnik Cəlil Xəlilov, təşkilatın Hərbi vətənpərvərlik şöbəsinin rəisi, polkovnik Adil Haqverdiyev, şəhid Sənan Axundovun həyat yoldaşı Nəcibə Axundova, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova, baş müəllimi Natiq Əliyev, Aprel döyüşlərinin iştirakçısı, tələbə Elşad Məmmədov və başqaları çıxış edərək Aprel döyüşlərinin Azərbaycan Silahlı Qüvvələrinin erməni qəsbkarları üzərində inamlı qələbəsi və Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin əmri ilə istənilən vaxt işğal altında olan torpaqlarmızı azad edəcəyi əzminin göstəricisi olduğunu qeyd ediblər.

Sonra tədbir iştirakçıları Pedaqoji Universitetin müəllim və tələbələrinin Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimov haqqında hazırladıqları videoçarxa baxıblar.

Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov "General Həzi Aslanov" yubiley medalı, universitetin bir qrup müəllim və tələbəsi isə Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının fəxri fərmanı ilə təltif edilib.




Sonda mükafatlar və hədiyyələr verilib, xatirə şəkilləri çəkdirilib. Tələbələrin hazırladıqları bədii-musiqili kompozisiya iştirakçılarda xoş əhvali-ruhiyyə yaradıb.

**Orxan Abdullayev**

# Professor Əbdüləzəl Dəmirçizadənin 110 illiyinə həsr olunmuş “Azərbaycan dilçiliyi: reallıqlar, tələblər” Respublika elmi konfransı

Aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli dilçi-alim, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, filologiya üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi, Dövlət mükafatı laureatı Əbdüləzəl Dəmirçizadənin 110 illiyinə həsr olunmuş “Azərbaycan dilçiliyi: reallıqlar, tələblər” Respublika elmi konfransı keçirilib. Qeyd edək ki, konfrans Təhsil naziri cənab Ceyhun Bayramovun 8 fevral 2019-cu il tarixli əmrinə əsasən təşkil edilib. Bu əmrə uyğun olaraq ADPU-nun rektoru, professor Cəfər Cəfərov müvafiq əmr imzalayıb. Əmrdə konfransın yüksək səviyyədə keçirilməsi məqsədi ilə universitetdə 11 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Konfransda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, ali təhsil müəssisələrinin, AMEA-nın alim-mütəxəssisləri, tanınmış ziyalılar iştirak ediblər.

Konfransı giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, ADPU-nun tanınmış, görkəmli, şöhrətli alimləri çoxdur. Onların arasında professor Əbdüləzəl Dəmirçizadə xüsusi yer tutur. Professor Ə. Dəmirçizadə Azərbaycan dilçilik elminin inkişafına böyük töhfələr verib. O, Azərbaycan dili tarixinin ilk tədqiqatçısıdır. Görkəmli alimin ədəbi dilimizin tarixinə həsr etdiyi elmi əsərləri Azərbaycan dilçiliyi tarixində mühüm əhəmiyyət kəsb edir. Həyatını Azərbaycan dilinin tədqiqinə və təbliğinə həsr edən mahir tədqiqatçı Ə. Dəmirçizadə öz elmi qənaətlərini ”Azərbaycan dili tarixi xülasələri”, ”M.F. Axundov dil haqqında və Axundovun dili”, ”Azərbaycan dilinin tarixi”, ”Azərbaycan ədəbi dilinin inkişaf yolları”, ””Kitabi-Dədə Qorqud” dastanının dili”, ”Azəri ədəbi dilinin tarixi”, ”Azərbaycan dilinin tarixi qrammatikası” və digər kitablarında təsdiq etmişdi. Onun elmi-pedaqoji fəaliyyəti zəngin və çoxcəhətlidir. Böyük alimin fundamental elmi əsərlərinə ulu öndər Heydər Əliyev yüksək qiymət vermişdir.

Konfransda Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova “Əbdüləzəl Dəmirçizadə-110”, Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev “Professor Əbdüləzəl Dəmirçizadə və ədəbi dilimiz” mövzularında məruzələrlə çıxış ediblər. Geniş, maraqlı və məzmunlu məruzələrdə qeyd edilib ki, Ə.Dəmirçizadə Azərbaycan dilçiliyində məktəb yaratmış alimlərimizdən biridir. Böyük alimin həyatının və elmi axtarışlarının çox böyük hissəsi ADPU ilə sıx bağlı olub. Ə.Dəmirçizadə Azərbaycan dil tarixini fundamental tədqiqata cəlb edərək tarixin müxtəlif mərhələlərinə məxsus dil hadisələrini öyrənib, türkdilli ailəyə mənsub olan Azərbaycan dilinin müqayisəli təhlilini aparıb, özünün qazandığı elmi nəticələrlə bərabər, alimlər üçün yeni tədqiqatın üfüqlərini göstərib. Alim haqlı olaraq hesab edirdi ki, dil canlı orqanizm olmaqla bərabər, özünün dərin qatlarında mənsub olduğu xalqın tarixini yaşadan ən başlıca amildir. Azərbaycan dilinin tarixi qrammatikasını araşdırarkən Ə.Dəmirçizadənin söykəndiyi mənbə XI



əsrin ən böyük türkoloq-filoloqu, etnoqraf, ilk türk ensiklopediyaçısı və türkologiyanın banisi Mahmud Kaşğarinin əsərlərindəki dil nümunələri olmuşdur. Professor Ə.Dəmirçizadənin elmi araşdırmalarında üslubiyyat başlıca yer tutur. Dilçiliyimizdə üslubiyyatin fundamental olaraq tədqiqata cəlb edilməsi, öyrənilməsi işində Ə.Dəmirçizadə birincilər cərgəsindədir. Alimin 1962-ci ildə nəşr etdirdiyi ”Azərbaycan dilinin üslubiyyatı” adlı kitabı dilçiliyimizdə hadisə kimi qəbul edildi. Professor Ə.Dəmirçizadənin ədəbi dil ilə bağlı gəldiyi elmi mülahizələri, bu problemə yanaşmaları ibrətamiz idi. Dilimizin sintaktik quruluşunun tədqiqinə aid yazılarında onun orijinal dəst-xətti daha aydın görünür. Professor Ə.Dəmirçizadə həm də şərəfli bir müəllim ömrü yaşayıb. O, pedaqoji fəaliyyəti müddətində tələbələrin sevimli müəlliminə çevrilməyi bacardı, uzun illər rəhbərlik etdiyi Azərbaycan dilçiliyi kafedrasını istedadlı tələbələrin elmi laboratoriyasına çevirə bildi. Birbaşa Ə.Dəmirçizadənin elmi rəhbərlik etdiyi namizədlik və doktorluq işlərinin sayı 50-dən çox idi. Tələbkar elmi rəhbərin rəyi ilə müdafiəyə buraxılan həmin işlər sonradan Azərbaycan dilçiliyində yeni elmi axtarışlara vüsət verirdi.

Görkəmli alim, böyük vətənpərvər Ə.Dəmirçizadənin Azərbaycan xalqı və elmi qarşısındakı xidmətləri heç vaxt unudulmur. Bakı şəhərindəki küçələrdən biri alimin adını daşıyır, vaxtilə yaşadığı binanın fasadına xatirə lövhəsi vurulub. Bu gün də Azərbaycanın ali məktəblərində təhsil alan tələbələr Ə.Dəmirçizadənin dərs vəsaitləri əsasında dilin əsaslarını öyrənir, tədqiqatçılar isə professorun kitablarından ən etibarlı mənbə kimi istifadə edirlər.

Professor Adil Babayev, professor Tərlan Novruzov, dosent Faiq Şahbazlı və filologiya üzrə elmlər doktoru Sevinc Əliyeva çıxışlarında professor Ə.Dəmirçizadəni yüksək təfəkkürə, zəngin təxəyyülə malik alim, qayğıkeş, nəcib, xeyirxah, müdrik, alicənab insan kimi səciyyələndiriblər.

Qeyd edək ki, professor Nizami Xudiyev böyük alimin 110 illiyinə həsr olunmuş “Professor Ə.Dəmirçizadə dünyası” adlı monoqrafiya hazırlayıb. Monoqrafiyada Ə.Dəmirçizadənin həyatı, yaradıcılığı və elmi-pedaqoji fəaliyyəti haqqında xatirə, düşüncə və mülahizələr öz əksini tapıb. Kitabın elmi redaktoru filologiya üzrə elmlər doktoru, professor Nəbi Əsgərovdur.

Sonra konfrans öz işini 3 bölmədə-Azərbaycan dilinin qloballaşma şəraitində inkişafına dair dövlət siyasəti, Azərbaycan dilçiliyinin aktual problemləri və Nitq mədəniyyəti problemləri bölmələrində davam etdirib. Bölmə iclaslarında ümumilikdə 60-dan çox məruzə dinlənilib. Bölmə iclaslarında məruzələr müzakirə edilib, fikir mübadiləsi aparılıb.

Konfransın yekun iclasında bölmə rəhbərlərinin hesabatları dinlənilib, müvafiq qərarlar qəbul edilib.

**Mahirə Mustafayeva**

## Unudulmaz xeyirxahım, müəllimim, akademik Əbdüləzəl Dəmirçizadənin əziz xatirəsinə

İlahi bir Əzəl, Ələs var idi,
Yəni ki, ibtida əzəl var idi.
Fikri dərin, nitqi gözəl var idi,
Elmimizdə Əbdüləzəl var idi.

O sevib öz doğma Oğuz elini,
Qədim Türk dilini, Qorqud dilini.
Görüb düşmənlərin xəyanətini,
Görüb “dostların”da fitnə-felini

Asta yerişliydi, usta baxışlı,
Hər əsəri dilçiliyə naxışdı.
“Qorqud dili” adlı ölməz əsəri,
Quru səhralara yağan yağışdı.

Ürəyi tək açıq idi süfrəsi,
Az olardı onun deyib-gülməsi.
O söz toxuyurdu, söz çözələrdi,
Əlindəydi sözün sapı, ilməsi.

Dəmirçiydi, zindanı söz, odu söz.
Fikri atəş, hər kəlməsi, odu söz.
Dilçilikdə əl çatmayan zirvədi
Dil elmində onun təkin ara, çöz.

Dəmirçi adını seçməmiş əbəs,
Başında olardı naxışla bir fəs.
Dərsləri o qədər canlı keçərdi,
Onu dinləməkdən doymazdı heç kəs.

Dilçilikdə məktəbi var, yeri var,
Bağçasının bəhrəsi var, barı var.
Həsəni, Cəfəri, Qəzənfəri var,
Həm də Tərlan kimi cəngavəri var!
Unudulmaz heç vaxt gözəl müəllim.
Ustadlar ustadı Əzəl müəllim!

**Tərlan Novruzov, professor**

# Professor Nizami Xudiyevin 70 illik yubileyinə və elmi-pedaqoji fəaliyyətinin 50 illiyinə həsr olunmuş tədbir

Aprelin 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli dilçi-alim, tanınmış ictimai-siyasi xadim, Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi, Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü Nizami Xudiyevin 70 illik yubileyinə və elmi-pedaqoji fəaliyyətinin 50 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, millət vəkilləri, hökumət nümayəndələri, Yeni Azərbaycan Partiyasının (YAP) və Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) məsul şəxsləri, media strukturlarının rəhbərləri, tanınmış və nüfuzlu ziyallılar, incəsənət xadimləri, universitetin müəllim və tələbələri iştirak ediblər. Tədbirdən öncə yubiley iştirakçıları professor Nizami Xudiyevin əsərlərindən ibarət sərgi, həmçinin “Kredo” qəzetinin alimin həyat və fəaliyyətinə həsr olunmuş xüsusi buraxılışı ilə tanış olublar.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov professor Nizami Xudiyevi dövlət başçımız cənab İlham Əliyevin 4 aprel 2019-cu il tarixli Sərəncamı ilə Azərbaycan Respublikasının ictimai-siyasi həyatında fəal iştirakına görə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünə layiq görülməsi münasibətilə təbrik edib, ona möhkəm cansağlığı, elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətində uğurlar arzulayıb. Rektor qeyd edib ki, bu, həm də universitetimizin kollektivinə verilən yüksək qiymətdir. Professor Nizami Xudiyev Azərbaycan cəmiyyətində geniş tanınır, yüksək nüfuza malikdir.



Böyük alimin həyat və fəaliyyəti barədə ətraflı məlumat verən rektor Cəfər Cəfərov bildirib ki, Nizami Manaf oğlu Xudiyev 1949-cu il aprel ayının 1-də Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunda ziyalı ailəsində anadan olub. 1966-cı ildə ADPU-nun Filologiya fakültəsinə qəbul olunan N.Xudiyev “Nizami Gəncəvi” adına fərdi təqaüdlə təhsil alıb. Universiteti fərqlənmə diplomu ilə bitirərək Elmi Şuranın qərarına əsasən Azərbaycan dilçiliyi kafedrasında müəllim vəzifəsində fəaliyyətə başlayıb. 1972-1973-cü illərdə həqiqi hərbi xidmətdə olub. 1978-ci ildə namizədlik, 1990-cı ildə doktorluq dissertasiyası müdafiə edərək filologiya elmləri doktoru alimlik dərəcəsi, professor elmi adı alıb.

1979-1991-ci illərdə ADPU-nun



Həmkarlar İttifaqı Komitəsinin sədri, 1991-1994-cü illərdə birinci prorektoru, 1994-1996-cı illərdə rektoru vəzifəsində çalışıb. 1996-2005-ci illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Şirkətinin, 2005-2006-cı illərdə isə “Azərbaycan Televiziya və Radio Verilişləri” Qapalı Səhmdar Cəmiyyətinin sədri olub. 1995, 2000 və 2005-ci illərdə Azərbaycan Respublikası Milli Məclisinə deputat seçilib. Milli Məclisdə dövlət quruculuğu, iqtisadi islahatlar, mədəniyyət və təhsil sahəsində qanun layihələrinin müzakirəsi zamanı tutarlı təklif və mülahizələri, işgüzar çıxışları, fəal mövqeyi ilə həmişə seçilib. Dövlət, hökumət və parlament nümayəndə heyətlərinin tərkibində dəfələrlə xarici ölkələrdə respublikamızı ləyaqətlə təmsil edib.

Dövlət strukturunda məsul vəzifə tutduğu dövrdə də professor N.Xudiyev elmi fəaliyyətini davam etdirib, ədəbi dil sahəsində sanballı tədqiqatları ilə Azərbaycan dilçilik elminin inkişafına böyük töhfələr verib. O, 60-dan çox monoqrafiya, dərslik və dərs vəsaitinin, 50-dən artıq sənədli televiziya filminin ssenari müəllifidir.

Professor N.Xudiyev orta məktəblərin 3,4,5,10,11-ci sinifləri üçün “Azərbaycan dili”, 2-ci siniflər üçün “Oxu”, ixtisaslaşdırılmış məktəblər üçün “Azərbaycan dili” və “Ana dili” dərsliklərinin müəlliflərindəndir. Elmi-kütləvi nəşrlərdə, kütləvi informasiya vasitələrində, müxtəlif jurnallarda 400-dən artıq elmi məqaləsi dərc edilib. Gərgin elmi araşdırmaların məhsulu olan “Azərbaycan ədəbi dilinin təşəkkülü”, “T?rsümə ədəbiyyatı və ədəbi dilimiz”, “Azərbaycan ədəbi dili tarixi”, “Azərbaycan ədəbi dilinin sovet dövrü”, “Heydər Əliyev və Azərbaycan dili”, “Xalq və dövlət naminə”, “Yazıçı dili və üslubu”, “Radio, televiziya və ədəbi dil”, “Xalqın tarixi haqqı: dilimiz, varlığımız”, “Zamanın axarı ilə” (I-II), “Şəxsiyyət və zaman”, “Uğurlu yolun layiqli davamçısı”, “?AR dünənin, bu günün, sabahın partiyasıdır”, “Cənubi Azərbaycanda ədəbi dilimizin dünəni və bu günü”, “Qədim türk yazılı abidələrinin dili” və digər fundamental əsərləri N.Xudiyevin Azər-



baycan elminə sanballı və əvəzolunmaz töhfəsidir.

Görkəmli alimin bir çox kitab və məqalələri xarici ölkələrdə- İran, Türkiyə, Rusiya, Almaniya, İraq, İsveçrə, Qazaxıstan, Özbəkistan, Türkmənistan, Qırğızıstan və digər ölkələrdə nəşr edilib. Professor N.Xudiyev türkoloq-alim kimi respublikamızda və dünyanın bir çox ölkələrində, həmçinin Moskva, Nalçik, Bişkek, Ufa, Aşqabad, Daşkənd, Gülüstan, Alma-Ata, Ankara, İstanbul, Əskişəhər, İzmir, Adana, Konya və başqa şəhərlərdə keçirilən nüfuzlu türkoloji tədbirlərin-qurultay, beynəlxalq simpozium və elmi konfransların nümayəndəsi olub və bu mötəbər toplantılarda elmi məruzələrlə çıxış edib.

Professor N.Xudiyev onun həyatında mühüm rol oynamış görkəmli dilçi-alim Əbdüləzəl Dəmirçizadənin 110 illiyinə həsr olunmuş “Professor Ə.Dəmirçizadə dünyası” adlı monoqrafiya hazırlayıb. Monoqrafiyada Ə.Dəmirçizadənin həyatı, yaradıcılığı və elmi-pedaqoji fəaliyyəti haqqında xatirə, düşüncə və mülahizələr öz əksini tapıb.

91 vətənpərvər ziyalıdan biri olan professor N.Xudiyev böyük bir məktəb - Heydər Əliyev məktəbi keçib və bu məktəbə sadiq qaldığını dəfələrlə əməli işdə təsdiq edib. Ölkəmizin ən nüfuzlu partiyası olan YAP-ın Siyasi Şurasının və İdarə Heyətinin üzvüdür. Azərbaycan Respublikasının ictimai-siyasi və mədəni həyatında fəal iştirakına görə 2009-cu ildə “Şöhrət” ordeni, 2012-ci ildə “Azərbaycan Respublikası Qabaqcıl təhsil işçisi” döş nişanı,



2013-cü ildə “Ən yaxşı vətənpərvər tədqiqatçı-alim” Qızıl medalı ilə təltif edilib. Bir çox beynəlxalq mükafatlara layiq görülüb, beynəlxalq elmi ictimaiyyət arasında yüksək nüfuza malikdir.

Tədbirdə professor N.Xudiyevə universitetdə uzun illər elmi-pedaqoji fəaliyyəti və 70 illik yubileyi münasibətilə universitetin Fəxri Fərmanı təqdim edilib.

Filologiya fakültəsinin Müasir Azərbaycan dili kafedrasının müdiri, professor Buludxan Xəlilov “Professor Nizami Xudiyevin elmi-pedaqoji və ictimai-siyasi fəaliyyəti” mövzusunda məruzə ilə çıxış edib. Professor B.Xəlilovun geniş, əhatəli, maraqlı və məzmunlu məruzəsində professor N.Xudiyevin zəngin, mənalı və şərəfli ömür yolu keçdiyi, Azərbaycan dilçiliyində öz mövqeyi, dəst-xətti olan görkəmli dilçi-alim, istedadlı və təcrübəli müəllim olduğu xüsusi vurğulanıb.

Baş Nazirin müavini Əli Əhmədov, akademik İsa Həbibbəyli, akademik Kamal Abdulla, akademik Nizami Cəfərov, akademik Möhsün Nağısoylu, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, professor Zahid Xəlil, professor Qulu Məhərrəmli, filologiya üzrə elmlər doktoru İlhami Cəfərsoy çıxış edərək professor N.Xudiyevin xeyirxah, nəcib, qayğıkeş insan, dəyərli ziyalı, yorulmaz, fədakar alim, yüksək səviyyəli peşəkar mütəxəssis, bacarıqlı elm və təhsil təşkilatçısı, ölkəmizin ictimai-siyasi həyatında fəal iştirak edən əsl vətəndaş olduğunu, dövlətə və dövlətçiliyə sədaqətlə xidmət etdiyini bildiriblər və ona möhkəm cansağlığı, uğurlar arzulayıblar.

Tədbirdə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİ) sədr müavini Mirzə Cəfərzadə professor N.Xudiyevə Komitənin yubiley medalını təqdim edib, uğurlar arzulayıb.

Sonda professor N.Xudiyev çıxış edərək yubiley tədbirinin təşkilatçılarına təşəkkür edib və bundan sonra da xalqa, dövlətə sədaqətlə, vicdanla xidmət edəcəyini vurğulayıb. Nəvəsi Nizami babasını təbrik edərək onunla fəxr etdiyini bildirib.

Azərbaycanın tanınmış incəsənət ustalarının konsert proqramı tədbirə xüsusi rəng qatıb.

**Könül Nəzərova**

## ADPU-nun Şəki Filialında inklüziv təhsillə bağlı təlimlər davam edir

Son illər respublikamızda təhsil sahəsində uğurlu islahatlar həyata keçirilir. Həyata keçirilən islahatlar ölkəmizdə təhsilin inkişafına və Avropanın qabaqcıl təhsil təcrübəsinin öyrənilərək tətbiq edilməsinə münbit şərait yaradır. Avropa İttifaqının maliyyə dəstəyi ilə Heydər Əliyev Fondunun “Regionların İnkişafı” İctimai Birliyinin və UNİCEF-in inklüziv təhsillə bağlı həyata keçirdiyi birgə layihələr də bu istiqamətdə görülən işlərdəndir. Həmin layihə çərçivə-



sində Azərbaycanın seçilmiş rayonlarında inklüziv təhsillə bağlı təlimlər həyata keçirilir. İcrasına 2018-ci ildən başlanılmış layihələr 2020-ci ildə sona çatacaq. Layihələrin həyata keçirilməsində əsas məqsəd Azərbaycanın seçilmiş regionlarında inklüziv təhsil üçün ibtidai sinif müəllimlərinin tədris imkanlarının və idarəetmənin, habelə pedaqoji resursların və bu sahədə təhsil siyasətinin təkmilləşdirilməsidir.

ADPU-nun Şəki Filialında professor-müəllim heyəti üçün də həmin layihə çərçivəsində - inklüziv təhsil üzrə müəllim hazırlığı proqramları əsasında təlimlər keçirilib. 12-15 mart, 9-12 aprel 2019-cu il tarixlərində təşkil olunan təlimləri filialdan seçilmiş və beynəlxalq ekspertlər tərəfindən təlim almış müəllimlər aparıblar. Ümumilikdə filial üzrə 72 nəfər müəllimin təlimlərdə iştirakı nəzərdə tutulub. Onlardan 36 nəfər artıq təlimlərdən keçib. Təlimlərdə iştirak edən filial əməkdaşlarına sertifikat təqdim olunub.

## ADPU-nun Quba Filialında “Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının artırılması” layihəsi çərçivəsində təlimlər davam edir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında ”Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının artırılması” layihəsi çərçivəsində təlimlərə start verilib. Qeyd edək ki, təlimlər Təhsil Nazirliyi ilə birgə əməkdaşlıq əsasında Avropa İttifaqının maliyyə dəstəyi ilə Heydər Əliyev Fondunun ”Regional İnkişaf” İctimai Birliyi (RİİB) tərəfindən icra olunur.

Layihənin inklüziv təhsil sahəsində müəllimlərin tədris imkanlarının və pedaqoji resurslarının təkmilləşdirilməsinə öz töhfəsini verəcəyi nəzərdə tutulub.



# Erasmus+ EQAC layihəsinin geniş təqdimatı

Aprelin 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Avropa Komissiyasının maliyyə dəstəyi ilə Erasmus+ proqramı çərçivəsində həyata keçirilən EQAC ("Azərbaycan universitetlərində Keyfiyyətin Təminatı Mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi") layihəsinin professor-müəllim heyəti üçün geniş təqdimatı keçirilib. Qeyd edək ki, təqdimat layihənin koordinatoru olan Bakı Biznes Universitetinin (BBU) ADPU-da layihənin yerinə yetirilməsi ilə bağlı monitorinqi çərçivəsində gerçəkləşib.

Təqdimatdan öncə ADPU-nun rektoru, professor Cəfər Cəfərov layihə iştirakçıları ilə görüşüb. Görüşdə BBU-nun rektoru, professor İbad Abbasov, ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Günay Məhərrəmova, həmin şöbənin mütəxəssisi və layihənin universitet üzrə koordinatıru Lətif Kəngərli, Bakı Biznes Universitetinin Beynəlxalq əlaqələr üzrə prorektoru Eşqin Bayramov, Layihələrin idarə olunması şöbəsinin müdiri Gülşən Bayramova iştirak ediblər.





ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq bildirib ki, universitet 100 illik yubileyinə hazırlaşır. Bu münasibətlə universitetdə islahatlar, yeniliklər, müxtəlif layihələr həyata keçirilir. Ali təhsil müəssisəsinin inkişafı beynəlxalq əlaqələrin yaradılması və genişləndirilməsi ilə sıx bağlıdır. Erasmus+ EQAC layihəsi qabaqcıl beynəlxalq təcrübənin öyrənilib tətbiq edilməsi baxımından xüsusi əhəmiyyət kəsb edir. Avropa Komissiyasının maliyyələşdirdiyi layihə 2017-2020-ci illəri əhatə edir. Bu layihə çərçivəsində ötən bir il ərzində ADPU-da cari vəziyyət öyrənilib, müvafiq sorğu keçirilib, hesabat hazırlanıb, əməkdaşlarımız layihə ilə bağlı müxtəlif respublika və beynəlxalq miqyaslı tədbirlərdə iştirak ediblər. Universitetdə Keyfiyyətin təminatı şöbəsi yaradılıb, professor-müəllim heyətinin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsi tətbiq edilir və bu, müəllimlər üçün motivasiya yaradır. ADPU-da insan resurslarının inkişaf etdirilməsinə xüsusi diqqət yetirilir. Universitetdə professor-müəllim heyətinin işə qəbulu seçki yolu ilə, tədris-köməkçi heyətin işə qəbulu isə müsabiqə yolu ilə həyata keçirilir. Həm seçki, həm də müsabiqə şəffaf, ədalətli və obyektiv keçirilir. Hədəfimiz təhsilin keyfiyyətinin yüksəldilməsi, müasir tələblərə cavab verən mütəxəssislər hazırlamaqdır.

BBU-nun rektoru, professor İbad Abbasov çıxış edərək səmimi və işgüzar görüşə görə təşəkkür edib. Professor İ.Abbasov qeyd edib ki, ADPU-da yeni komanda formalaşıb. Bu komanda universitetdə islahatların aparılmasında, həmçinin Erasmus+EQAC layihəsində fəal iştirak edir. Bizim Avropa ali təhsil məkanına inteqrasiya etməyimiz həm də dünyaya inteqrasiya etməyimiz deməkdir. Təhsil daim təkmilləşən, yeniləşən, inkişaf etməkdə olan sahədir. Bu sahədə işin yenidən qurulması, islahatların aparılması olduqca vacibdir. Ali təhsilin beynəlmiləlləşməsi, rəqabətqabiliyyətli mütəxəssislərin hazırlanması qarşımızda dayanan əsas vəzifədir. BBU Avropanın 15 ölkəsinin 20-yə yaxın universiteti ilə sıx əlaqə qurub. Belə layihələr bizə qarşımıza qoyduğumuz məqsədlərə çatmağa kömək edir.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə layihənin uğurlu və kreativ olduğunu bildirərək əməkdaşlığın gələcəkdə də davam etdirilməsinin vacibliyini vurğulayıblar.

Sonra tədbir Heydər Əliyev məktəbinin lektoriyasında davam edib.

BBU-nun Layihələrin idarə olunması şöbəsinin müdiri Gülşən Bayramova çıxış edərək təmsil etdiyi ali təhsil müəssisəsinin beynəlxalq əlaqələri, yerli və xarici layihələrdə iştirakı, təhsilin keyfiyyət göstəricilərinin yaxşılaşdırılması üçün görülən işlər barədə ətraflı məlumat verib. O, sözügedən layihənin yaranma səbəbini, bununla bağlı aparılmış tədqiqatların nəticələri, layihənin detalları və tərəfdaş universitetlər üçün gələcək töhfəsi haqqında danışıb.

ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov Erasmus+EQAC layihəsi haqqında təqdimatla çıxış edib. R.Sadıqov təqdimatında bildirib ki, layihənin Avropa üzrə tərəfdaşları Alikante Universiteti (İspaniya), Kral Texnologiya İnstitutu (İsveç), SMK Tətbiqi Elmlər Universiteti (Litva), Midlsaks Universiteti (Böyük Britaniya), EKT Akkreditasiya Təşkilatı (Litva), Azərbaycan üzrə isə Təhsil Nazirliyi, Bakı Biznes Universiteti, Azərbaycan Dövlət Pedaqoji Universiteti, Naxçıvan Universiteti, Sumqayıt Dövlət Universiteti, Mingəçevir Dövlət Universiteti, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Gəncə Dövlət Universiteti, Azərbaycan Turizm və Menecment Universiteti, Azərbaycan Kooperasiya Universiteti, Azərbaycan Texnologiya Universiteti, Odlar Yurdu Universitetidir.

Təqdimatda Erasmus+EQAC layihəsi ilə bağlı həyata keçirilmiş tədbirlər, ali təhsil müəssisələrində keyfiyyətə təsir edən əsas amillər, keyfiyyətin artırılması sahəsində Avropa təcrübəsi, keyfiyyətin artırılması ilə əlaqədar ADPU-da görülmüş işlər, eləcə də universitetdə layihə ilə bağlı həyata keçirilmiş işlərdən danışılıb. Bildirilib ki, Azərbaycan universitetlərində keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və inkişaf etidirilməsi, universitetlərdə keyfiyyətin artırılması və iş prinsiplərinin beynəlxalq standartlara uyğunlaşdırılması, təlimlərin keçirilməsi, yerli və xarici səfərlərin təşkili, ən əsası isə layihənin sonunda universitetlərdə keyfiyyətin daha mükəmməl idarəetmə sisteminin qurulması məqsədilə onlayn platformanın yaradılaraq tətbiq edilməsi layihənin əsas məqsədlərini təşkil edir. Təqdimatda keyfiyyətin təminati üçün şəraitin yaradılması, keyfiyyətli öyrətmə və öyrənmə, keyfiyyətli idarəetmənin inkişaf etdirilməsi, universitetlərdə Avropa ali təhsil məkanında keyfiyyətin təminatı üzrə mövcud olan standartların və təlimatların tətbiqinin genişləndirilməsi, tədrislə tədqiqatın vəhdəti, Avropa universitetləri ilə uzunmüddətli əməkdaşlığın yaradılması yolu ilə təcrübə mübadiləsi və digər vacib məqamlar öz əksini tapıb.

R.Sadıqov qeyd edib ki, inzibati heyət, professor-müəllim heyəti və təlimçilər üçün inkişaf proqramının təşkili, təlimlərin keçirilməsi, keyfiyyətin təminatı prosesinin dəstəklənməsi üçün resursların inkişafı, keyfiyyətin təminatı məqsədilə onlayn platformanın tətbiq edilməsi və genişləndirilməsi (QPR proqramı), avropalı tərəfdaşlarla beynəlxalq əlaqələrin inkişaf etdirilməsi olduqca vacibdir. Layihənin sonunda gözlənilən nəticələrə layihədə iştirak edən hər bir universitetdə Keyfiyyətin təminatı şöbəsinin yaradılması, sözügedən şöbənin strukturunun və heyətinin, eləcə də prosesə cəlb edilən əməkdaşların təcrübəsinin inkişaf etdirilməsi, nailiyyətlərinin təkmilləşdirilməsi, tədqiqatın, akademik və inzibati heyətin və tələbələrin bacarıqlarının inkişaf etdirilməsi, Avropa ali təhsil məkanında keyfiyyət təminatı üzrə standartlar və təlimatların (ESG) tətbiqinin genişləndirilməsi daxildir.

Tədbir layihə ilə bağlı sualların cavablandırılması və müzakirələrlə başa çatıb.

**Günay Bağırlı**

# ADPU-da Bakı Avropa Liseyinin Kiçik Elmlər Akademiyasının 20 illik yubileyi qeyd olunub

Aprelin 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bakı Avropa Liseyinin Kiçik Elmlər Akademiyasının 20 illik yubileyinə həsr olunmuş XI elmi-praktik konfrans keçirilib. ADPU-nun rəhbərliyinin, fakültə dekanlarının, kafedra müdirlərinin, şöbə müdirlərinin, müəllim və tələbələrin, görkəmli alimlərin və təhsil işçilərinin iştirak etdikləri tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb.



Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Bakı Avropa Liseyinin fəaliyyətini yüksək qiymətləndirib. Rektor bildirib ki, lisey Azərbaycan təhsil sisteminin keyfiyyətcə yeni mərhələyə keçməsinə xidmət edir.

Bakı Avropa Liseyinin direktoru, təhsil üzrə beynəlxalq ekspert, psixologiya elmləri üzrə fəlsəfə doktoru Zülfiyyə Veysova rəhbərlik etdiyi liseyin yaranma tarixindən danışıb. Qeyd edib ki, 1991-ci ildə yaradılmış liseyin istedadlı uşaqların üzə çıxarılmasında, onların elmə cəlb olunmasında, müxtəlif layihələrin həyata keçirilməsində xidmətləri var. 8 siniflə fəaliyyətə başlayan liseydə hazırda 1380 nəfər şagird təhsil alır. Bu təhsil müəssisəsində çoxlu sayda innovativ ideyalar tətbiq olunub. Liseydə 25 ildir ki, innovativ təlim sistemi olan fənlərarası təlim proqramı həyata keçirilir. Bu proqramın əsasında 2000-ci ildə Bakı Avropa Liseyinin Kiçik Elmlər Akademiyası yaradılıb. Kiçik Elmlər Akademiyasının məqsədi şagirdlərdə elmə maraq oyatmaq, elmi-tədqiqat bacarıqları, elmdə öz bacarıqlarını yoxlamaq və özünəinam keyfiyyətlərini aşılamaqdır. Kiçik Elmlər Akademiyasında 20 il ərzində 400-dən çox elmi iş hazırlanıb və təqdim olunub. Kiçik Elmlər Akademiyası fəaliyyət göstərdiyi 20 il ərzində 500 nəfərin iştirak etdiyi 10 konfrans keçirib. Akademiyanın tədqiqatları müxtəlif elm sahələrini - fizika, kimya, biologiya, riyaziyyat, informasiya texnologiyaları, tibb, ekologiya, tarix, coğrafiya, iqtisadiyyat, politologiya, filologiya, dilçilik, psixologiya, sosiologiya, kulturologiya, incəsənət və memarlıq sahələrini əhatə edir. Kiçik Elmlər Akademiyasının məzunları dünyanın nüfuzlu ali məktəblərində təhsil alıb, onlardan bir neçəsi dünyanın məşhur universitet və laboratoriyalarında uğurla fəaliyyət göstərirlər.



Tədbirdə çıxış edən Təhsil nazirinin müavini Firudin Qurbanov konfransın əhəmiyyətini vurğulayıb. Kiçik Elmlər Akademiyasının yaradılmasını təqdirəlayiq hal kimi dəyərləndirən F.Qurbanov bildirib ki, hər bir ölkənin inkişafında elm və təhsil mühüm rol oynayır. Bunun üçün də əsas amillərdən biri istedadlı uşaqları aşkar etmək, onların inkişafını təmin etməkdir. Bu baxımdan Kiçik Elmlər Akademiyası və 10 il sonra Təhsil Nazirliyinin dəstəyi ilə digər məktəblərdə yaradılmış belə akademiyalar ölkəmizdə həm təhsilin, həm də elmin inkişafına böyük töhfə verir.



Müasir dünyada elmin, təhsilin mühüm rolunu qeyd edən Dövlət İmtahan Mərkəzinin Direktorlar Şurasının sədri Məleykə Abbaszadə qeyd edib ki, Bakı Avropa Liseyinin təhsil modeli yeni və daha səmərəli təhsil yanaşmalarının tətbiqinə və müasir tələbləri özündə əks etdirən metod və texnologiyalara əsaslanır. Liseydə tətbiq olunan ən mühüm innovasiyalar uşaqlara daim dəyişən, inkişaf edən dünyada uğur qazanmağa imkan yaradır.

Bakı Dövlət Universitetinin Gender və psixologiya kafedrasının müdiri, "İnkişaf" Respublika Elmi-Praktik Mərkəzin (REPM) direktoru, professor Rəna İbrahimbəyova Bakı Avropa Liseyində tətbiq olunan təlim metodlarının üstünlüklərindən danışıb.

Bakı Avropa Liseyinin elmin inkişafında uğurlar əldə etdiyini deyən Yasamal Rayon İcra Hakimiyyətinin başçısı Əziz Əzizov rəhbərlik etdiyi qurumun adından liseyə fəxri fərman təqdim edib.

Konfransda videoçarx vasitəsilə Kiçik Elmlər Akademiyasının məzunlarının çıxışları dinlənilib.

Kiçik Elmlər Akademiyasının rəhbəri, psixoloq və FAT müəllimi Viktoriya Nəzərova çıxış edərək konfransın işinə uğurlar arzulayıb.

Tədbirdə Zərifə Əhmədzadənin və Taleh Əliyevin müəllifi olduqları "Neftin çıxarılma əmsalını artıran reagentin sintezi və sınağı", Ləman Əliyevanın "Pilotsuz uçuş aparatları üçün paraşüt" elmi işlərinin təqdimatı olub.

Sonra konfrans öz işini 5 bölmədə- Təbiət elmləri, Ekologiya və tibb, Psixologiya-Pedaqogika, Sosiologiya, İqtisadiyyat, Politologiya bölmələrində davam etdirib.

**Nurlan Səmədov**

# "ADPU-da Milli Kino Festivalı" adlı tədbir





Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin təşəbbüsü ilə "ADPU-da Milli Kino Festivalı" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vurğun Məmmədov, Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, müəllim və tələbələr iştirak ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək tədbir iştirakçılarını Milli Kino Günü münasibətilə təbrik edib və tələbələrə öz tövsiyələrini verib.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova çıxışında tədbir iştirakçılarını Milli Kino Günü münasibətilə təbrik edib və bu tədbiri tələbələrin uğuru adlandırıb. Professor M.Hüseynova Filologiya fakültəsində hər ay tələbələrin yaradıcılıq gününün keçiriləcəyini və belə tədbirlərin davamlı olacağını vurğulayıb.

Tədbirdə Filologiya fakültəsinin tələbələrinin milli kinolarımızdan hazırladıqları səhnəciklər təqdim olunub və tədbirin qonaqları Mirələm Mirələmov, Xəyal Hümbətov, Elgün Hüseynov milli kinolarımızda səslənən mahnıları ifa ediblər.

Tədbirin sonunda Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova hər kəsə təşəkkürünü bildirib.

**Könül Nərimanqızı**



# Fizika və texnologiya fakültəsinin müstəqil fakültə kimi fəaliyyətə başlamasının 50 illiyi və "Fizika günü" ilə bağlı tədbir

Aprelin 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində fakültənin müstəqil fakültə kimi fəaliyyətə başlamasının 50 illiyi və "Fizika günü" ilə bağlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Tədris Depatamentinin direktoru, dosent Sənan Əliyev, fakültənin görkəmli məzunları, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi üzvü, Fizika İnstitutunun elmi işlər üzrə direktor müavini, akademik Cavad Abdinov, Elmi-Tədqiqat Nəqliyyat və Aviakosmik Problemlər İnstitutunun (ETNAPİ) direktoru, Milli Aviasiya Akademiyasının kafedra müdiri, akademik Bahadur Tağıyev, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) direktoru, dosent İsrayıl İsgəndərov, Azərbaycan Memarlıq və İnşaat Universitetinin (AzMİU) Fizika kafedrasının müdiri, professor Adil Abdullayev, professor Tahir Pənahov, "Tərəqqi" liseyinin direktoru, professor Nasim Abışov, fakültə dekanları, məktəb direktorları və şagirdləri, fakültənin professor-müəllim heyəti və tələbələri iştirak ediblər.

Tədbirdən öncə qonaqlar Eksperimental qrupun, ADPU-nun SABAH qruplarının, fakültənin I və II tədris ili tələbələrinin hazırlayıb ingilis, rus və azərbaycan dillərində təqdim etdikləri maraqlı fiziki təcrübələrlə tanış olublar.

Tədbiri təbrik sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, Ali Pedaqoji İnstitut yaradılarkən fəaliyyət göstərən 3 şöbədən biri Fizika-riyaziyyat şöbəsi olmuşdur. İlk dekan Peterburq Universtetinin məzunu, professor M.Əfəndiyev olmuşdur. Şöbənin fizika bölməsində dosent R.Məlikov, N. Berq və başqaları çalışmışlar. Keçən əsrin 30-cu illərində şöbə Fizika-riyaziyyat fakültəsi adlandırılmış və fakültəyə professor A.Abbaszadə dekan təyin edilmişdir. Fizika-riyaziyyat fakültəsi 1968-1969-cu tədris ilində iki müstəqil fakültəyə-fizika və riyaziyyat fakültələrinə ayrılmışdır. Fizika fakültəsinin ilk dekanı, dosent Teyfur Xasməmmədov (1968-1971) olmuşdur.

Azərbaycanın görkəmli fiziki, Sovet hakimiyyəti dövründə yarımkeçiriciləri ilk tədqiq edənlərdən biri, Azərbaycan Dövlət mükafatı laureatı, SSRİ Elmlər Akademiyasının müxbir üzvü, Azərbaycan EA-nın həqiqi üzvü, 1970-1983-cü illərdə Azərbaycan EA-nın prezidenti olmuş Həsən Abdullayev bu fakültənin məzunu olmuşdur. Hazırda AMEA-nın fizika üzrə 2 həqiqi üzvü-akademik Cavad Abdinov və akademik Bahadur Tağıyev də Fizika fakültəsinin









məzunlarıdırlar. Yarandığı gündən bu günə qədər Fizika fakültəsi ölkəmizin elminə və təhsilinə xidmət edən onlarla məzun yetişdirmiş, müxtəlif elm və təhsil müəssisələrində çalışan elmlər doktoru, professor Fizika fakültəsinin auditoriyalarında ilk addımlarını atmışdır. ADPU-nun Fizika fakültəsinin məzunu adını daşıyan elm xadimlərimizdən professor Abbasqulu Abbaszadə, professor Zahid Qaralov, professor Abdulla Mehrabov, professor Tahir Pənahov,



professor Yusif Əsədov, professor Hidayət Nuriyev, professor Əflatun Həsənov, professor Vaqif Nəsirov, professor Fikrət İsayev, professor Şükür Əlizadə, Bəstəkar Oqtay Rəcəbov və başqalarının adını fəxrlə çəkə bilərik. Fakültənin minlərlə məzunu Azərbaycanın kənd və şəhərlərində məktəblərdə ləyaqətlə universitetimizi, Fizika fakültəsini təmsil edirlər.

Ötən illər ərzində və hazırda fakültənin əməkdaşları gənc nəslin təlim-tərbiyəsi ilə, onların layiqli fizika müəllimi kimi yetişmələri üçün fizikanın tədrisi metodikasını təkmilləşdirməklə yanaşı, həm də fundamental fizikadan elmi araşdırmalar da aparırlar.

Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun keçirdiyi "Elm-Təhsil İnteqrasiyası" məqsədli qrant müsabiqəsində fakültənin əməkdaşlarının AMEA-nın Fizika İnstitutu ilə birlikdə təqdim etdikləri "Kationları nadir torpaq elementləri ilə qismən əvəz edilmiş mis xalkogenidlərinin quruluş və dielektrik xassələrinə qamma-şüalanmanın təsiri" mövzusu qalib layihələr sırasındadır. Elmi-tədqiqat işləri üçün yeni cihazlar, qurğular və tədqiqat üsulları yaradılmış, 20-dən artıq ixtira üçün müəlliflik şəhadətnaməsi alınmışdır. Fakültədə tədris olunan fənlərdən dərslik və dərs vəsaitlər hazırlanmışdır. Respublikamız müstəqillik qazandıqdan sonra təhsil sahəsində aparılan islahatların həyata keçirilməsində fakültənin əməkdaşları fəal iştirak edirlər. Azərbaycan təhsil sisteminin dünya təhsil sisteminə tam inteqrasiya olunmasının təmin edilməsində, orta ümumi təhsil məktəblərində "Fizika" və "Astronomiya" fənlərinin dövlət standartlarının müəyyənləşdirilməsində, proqramları tərtib olunmasında, müasir konsepsiyalar və qəbul olumuş proqram əsasında VII-XI siniflər üçün "Fizika", XI siniflər üçün "Astronomiya" milli dərslikləri, "Elektron dərsliklər", multimedialar hazırlanmışdır. Fakültədə tədrisin keyfiyyətinin artırılması istiqamətində müxtəlif klublar, mərkəzlər yaradılıb, təlimin effektivliyinin artırılması istiqamətində çalışmalar davam etdirilir. Eksperimental qruplar yaradılıb, STEM dərsləri keçirilir. Fakültənin əməkdaşları xarici ölkələrdə keçirilən mötəbər tədbirlərdə uğurla çıxış edirlər. (Danimarka, Türkiyə, Rusiya və s.).Web of Science daxil olan impakt-faktorlu jurnallarda məqalələr çap edilir.

Rektor Cəfər Cəfərov tələbələrin təqdim etdikləri təcrübələrdən danışaraq qeyd edib ki, kənardan fizikanın çətin və cansıxıcı görünməsinə rəğmən, bu gün fakültənin tələbələrinin hazırladıqları işlərdə fizikanın həyatla necə əlaqəli elm olduğunu gördük. Fakültə əməkdaşlarını fakültənin 50 illik yubileyi və "Fizika günü" münasibətilə təbrik edən rektor professor-müəllim heyətinə və tələbələrə uğurlar arzulayıb.

Sonra fakültənin məzunu, AMEA-nın həqiqi üzvü, Fizika İnstitutunun elmi işlər üzrə direktor müavini, akademik Cavad Abdinov çıxış edərək, özünün tələbəlik həyatından xatirələrini tədbir iştirakçıları ilə bölüşüb. O, qeyd edib ki, ADPU ölkəmizin təhsilinə və elminə çox böyük töhfələr vermişdir. Bu universitetin 3 məzunu müxtəlif illərdə Elmlər Akademiyasının prezidenti olmuşdur. Azərbaycanda müasir fizikanın banisi, akademik Həsən Abdullayev bu fakültəni bitirmişdir. Hazırda Akademiyanın Fizika İnstitutunun 7 laboratoriyasının rəhbəri, elmi işlər üzrə direktor müavini bu universitetin məzunudur. 100-ə yaxın məzun Akademiyanın müxtəlif institutlarında elmlər doktoru, elmlər namizədi kimi tədqiqatlar aparır. Mən inanıram ki, hazırda ADPU rəhbərliyinin həyata keçirdiyi uğurlu islahatlar universitetin əvvəlki nüfuzunu bərpa edib, inkişaf etdirəcəkdir. Fakültədə görülən işlər bunu deməyə əsas verir. Sonda akademik Cavad Abdinov fakültənin tələbə və müəllim heyətini yubiley münasibətilə təbrik edib, uğurlar arzulayıb.

Elmi-Tədqiqat Nəqliyyat və Aviakosmik Problemlər İnstitutunun (ETNAPİ) direktoru, Milli Aviasiya Akademiyasının kafedra müdiri, akademik Bahadur Tağıyev çıxış edərək deyib ki, bu gün mən öz tələbəlik illərimə qayıtdım, özümü tələbə kimi hiss etdim. Mən ali təhsil alanda mənə professor Abbasqulu Abbaszadə, professor Abdulla Muxtarov kimi görkəmli alimlər dərs demişlər. Mən arzu edirəm ki, gələcəkdə də bu universitetin, Fizika fakültəsinin auditoriyalarında da elmə, təhsilə xidmət edən görkəmli alimlər yetişsin.Bu məqsədlə mən fakültə dekanından xahiş edirəm ki, bizim laboratoriyalarda fizika ilə, konkret olaraq işıq texnologiyaları ilə yaxından tanış olmaq üçün tələbələri seçib göndərsin. Bu gün fakültə tələbələrinin ingilis, rus dillərində göstərdikləri təcrübələr, müxtəlif robotları kodlaşdıraraq onların işini göstərmələri fakültədə təhsilə və elmə qayğı göstərildiyini, tələbələrə elmə marağın təşviq olunduğuna sübutdur. Mən hamını bu bayram münasibətilə təbrik edir və fakültə rəhbərliyinə bu işdə uğurlar arzulayıram.

Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov ADPU-nun rektoru, professor Cəfər Cəfərova, akademik Cavad Abdinova və akademik Bahadur Tağıyevə cıxışlarına görə minnətdarlığını bildirərək deyib ki, son illər fakültəmiz özünün inkişaf dövrünü yaşayır, fakültədə tələbələrin keyfiyyətli təhsil almaları üçün universitet rəhbərliyi hər cür şərait yaradıb. Hazırda fakültəmizdə Tələbə Elmi Cəmiyyətinin "İlk addımlarım" elmi konfransları keçirilir, "Young Physics" klubu, "Peşəkar vərdişlər" Mərkəzi və s. fəaliyyət göstərir. Fakültəmizdə unuversitetdə ilk olaraq Eksperimental qrup yaradılıb. Onlara tədris planında nəzərdə tutulan fənlərdən əlavə STEM, Science, Engeenering, xarici dillər də tədris olunur. Fürsətdən istifadə edərək bu dərslərin keçirilməsində fakültəmizə təmənnasız kömək edən Fizika Muzeyinin yaradıcısı Elçin Abbasova, Rüfət Əzimova, Yalçın İslamzadəyə, Ceyhun Cabbarova, Ravil Rzayevə, Hafiz Veysova təşəkkür edirəm. Hazırda fakültəmizdə tədris planlarının yenilənməsi istiqamətində işlərimiz davam edir. Çalışacağıq ki, fakültəmizdə təhsilin səviyyəsini daha da yüksəldək. Bu gün burada həm də orta məktəblərin direktorları, fizika müəllimləri və şagirdlər iştirak edirlər. Ümid edirəm ki, onlar bu tədbirdə iştirak etmələrindən məmnun qalıblar. Sonda tədbirin təşkil edilməsinə görə dosent Xatirə Adıgözəlovaya, dosent Xankişi Məmmədova, dosent Namiq Niftiyevə, kafedra müdirlərinə və fakültə TGT-nin sədri Mülkü Yusifliyə təşəkkürümü bildirirəm.

Tədbir iştirakçıları sonra fakültənin tələbələrinin hazırladıqları musiqili-əyləncəli konsert proqramına baxıblar. Tələbələrin ifasında rəqslər, səhnəciklər və mahnılardan qonaqlar məmnun qalıblar. Tədbir "Yallı" rəqsi ilə sona çatıb.

**"Gənc müəllim"**

# ADPU Türkiyə ilə təhsil sahəsində əlaqələrini genişləndirir



Aprelin 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Türkiyə Respublikasının Ankara Regional Milli Təhsil İdarəsinin müdiri Turan Akpınar, İstanbul Regional Milli Təhsil İdarəsinin müdiri Levent Yazıcı, İzmir Regional Milli Təhsil İdarəsinin müdiri Ömer Yahşi ilə görüşüb. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Azərbaycan Respublikasının Türkiyədə Təhsil müşaviri Nəcibə Nəsibova, Türkiyə Respublikasının Azərbaycandakı Təhsil müşaviri Mahmut Ağırman, Təhsil Nazirliyinin Beynəlxalq əlaqələr idarəsinin məsul əməkdaşı Tural Əhmədov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin sektor müdiri Anar Qədiməliyev iştirak ediblər.

Rektor Cəfər Cəfərov qonaqları salamlayaraq onları rəhbərlik etdiyi ali təhsil müəssisəsində görməkdən məmnunluq duyduğunu bildirib. ADPU-nun tarixi barədə məlumat verən rektor qeyd edib ki, universitet 1921-ci ildə yaradılıb. ADPU ölkəmizin ictimai-siyasi və elmi-mədəni həyatında mühüm rol oynayıb. Universitetin 150 mindən çox məzunu olub. Son illər ölkəmizdə müəllim hazırlığının daha da genişləndirilməsi üçün dövlət səviyyəsində mühüm tədbirlər həyata keçirilib. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu filialları ilə birlikdə ADPU-ya qoşulub. Bu birləşmə nəticəsində ADPU geniş şəbəkəyə malik ali təhsil müəssisəsinə çevrilib. Bakıda tədris 4 binada aparılır. ADPU-nun 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. Universitetdə 17 mindən çox tələbə təhsil alır. Təhsil Nazirliyi ADPU-nun fəaliyyətinə xüsusi diqqət yetirir.

Rektor qeyd edib ki, son illər həyata keçirilən məqsədyönlü tədbirlər nəticəsində cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzu yüksəlib. Müəllimlərin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi keçirilib, onların əməkhaqqı artırılıb, məktəblərin infrastrukturu yenilənib. Əgər 3 il bundan əvvəl 500-dən çox bal toplayan 3 nəfər gənc ADPU-nun seçmişdisə, 2018-2019-cu tədris ilində 500-dən çox bal toplayan 566 nəfər gənc ali təhsil almaq üçün ADPU-nu seçib. Biz ADPU-nun yenilənməsi, müasirləşməsi, təhsilin keyfiyyətinin yüksəldilməsi ilə yanaşı, beynəlxalq əlaqələrinin genişləndirilməsinə də xüsusi önəm veririk. Türkiyə universitetləri ilə əlaqələrimizin genişləndirilməsi üçün səmərəli fəaliyyət gerçəkləşdiririk.

Türkiyə Respublikasının Azərbaycandakı Təhsil müşaviri Mahmut Ağırman, Azərbaycan Respublikasının Türkiyədə Təhsil müşaviri Nəcibə Nəsibova çıxış edərək səmimi və işgüzar görüşə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Qeyd edilib ki, müəllimlik şərəfli, müqəddəs və məsuliyyətli peşədir. ADPU bu şərəfli və müqəddəs peşə sahiblərinin hazırlanması missiyasını uğurla həyata keçirir.

Görüşdə ADPU-nun Türkiyə ilə təhsil sahəsində əlaqələrinin daha da genişləndirilməsi və gələcək əməkdaşlığın yeni istiqamətləri müzakirə edilib.

Görüşdə hədiyyələr təqdim edilib, xatirə şəkli çəkdirilib. Sonda qonaqlar ADPU-nun tədris binası, o cümlədən Türk araşdırmalar elmi-tədqiqat mərkəzi, TÜRKSOY kafedrası ilə tanış edilib.

**Orxan Fəxrəddinoğlu**

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində "Bir gün rəhbər olsaydım..." layihəsi



Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Elmi Şurasının müvafiq qərarı ilə aprelin 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ilk dəfə olaraq "Bir gün rəhbər olsaydım..." layihəsi həyata keçirilib.

Layihədə iştirak etmək üçün tələbələr ərizələrlə müraciət ediblər. Fakültə rəhbərliyi ərizələri araşdıraraq fakültənin dekan, dekan müavini, Musiqi və onun tədrisi metodikası, Təsviri incəsənət və onun tədrisi metodikası, Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedralarının müdiri vəzifələrinə namizədləri müəyyənləşdirib.

Fakültə dekanı-"Təsviri incəsənət müəllimliyi" ixtisası üzrə təhsil alan 205-ci qrup tələbəsi İlhamə Seyfullayeva.

Dekan müavini-"Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimlyi" ixtisası üzrə təhsil alan 103-cü qrup tələbəsi Şəms Abdulrəhimli.

Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri-"Musiqi müəllimliyi" ixtisası üzrə təhsil alan 301-ci qrup tələbəsi Aslan Mehdiyev.

Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müdiri-"Təsviri incəsənət müəllimliyi" ixtisası üzrə təhsil alan 402-ci qrup tələbəsi Lamiyə Babayeva.

Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrasının müdiri-"Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimlyi" ixtisası üzrə təhsil alan 201-ci qrup tələbəsi Sevil Qəribova.

Aprelin 26-da, səhər saat 8:30-da layihəyə start verilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov layihəyə dəstək nümayiş etdirərək tələbə idarəetməsini izləmək üçün fakültəyə gəlib, vəzifələri icra edən tələbələrlə görüşüb, iclaslarda iştirak edib və gənc rəhbərlərə tövsiyələrini verib.

Layihəni izləmək üçün Məzun, koordinasiya və karyera bölməsinin mütəxəssisi Solmaz Məmmədova fakültəyə gələrək gənclərlə görüşüb, onlarla birgə auditoriyalara baş çəkib və dərslərin gedişi ilə maraqlanıb.

Tələbə-dekan iclas keçirərək kafedra müdrilərinin iş planı ilə tanış olub, müəllim və tələbələrin müraciətlərini dinləyərək qərarlar verib.

Kafedralarda müxtəlif vaxtlarda iclaslar keçirilib. Dekan müavini davamiyyəti yoxlayaraq qeydlərini aparıb, kolokviumların gedişinə nəzarət edib.

Dərs gününün sonunda gənc rəhbərlər rektora ünvanlanan hesabatlarını təqdim ediblər.

# "Tariximizin xanlıqlar dövrünün siyasi irsi sənədlər işığında" kitabının təqdimat mərasimi

Aprelin 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi üzvü Ramiz Mehdiyevin "Tariximizin xanlıqlar dövrünün siyasi irsi sənədlər işığında" kitabının təqdimat mərasimi keçirilib. Təqdimat mərasimində ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, Bakı Dövlət Universitetinin Sosial və pedaqoji psixologiya kafedrasının müdiri, professor Kamilə Əliyeva, müəllim və tələbələr iştirak ediblər.




Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov akademik Ramiz Mehdiyevin ictimai-siyasi fəaliyyəti ilə yanaşı, Azərbaycan dövlətinin ideoloji əsaslarını təşkil edən bir sıra sanballı tədqiqat əsərlərinin müəllifi olduğunu vurğulayıb. Qeyd edib ki, "Tariximizin xanlıqlar dövrünün siyasi irsi sənədlər işığında" kitabı da akademikin əvvəlki fundamental tədqiqatları kimi böyük elmi əhəmiyyətə malikdir. Akademik Ramiz Mehdiyevin elmi faktlara əsaslanan bu yeni kitabı zəngin fikir və mülahizələrlə xanlıqlar dövrünə aid bir çox yanlış yanaşma və şərhləri aradan qaldırmaq baxımından çox dəyərli tədqiqat əsəridir. Ümumilikdə 22 orijinal sənədin daxil edildiyi toplu xanlıqlar dövrünün siyasi təhlilinə və tarixi dəyərləndirilməsinə həsr olunan sanballı tədqiqat işidir. Əsər Azərbaycan tarixinin fəlsəfəsinin öyrənilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Kitab tarixi əsər olduğu dərəcədə də sosial-fəlsəfi əsər kimi öyrənilməlidir. Geniş və hərtərəfli elmi-tədqiqatlar nəticəsində ərsəyə gələn bu fundamental əsər xanlıqlar dövrümüzə yeni elmi və obyektiv baxışdır.

Rektor vurğulayıb ki, akademik Ramiz Mehdiyevin yeni kitabı tarixçi alimlər üçün yol xəritəsi də sayıla bilər. Görkəmli alim bu sahənin mütəxəssislərinə çağırış edərək yazır: "Tarixçilərimiz, filosoflarımız, ədəbiyyatşünaslarımız, mədəniyyətşünaslarımız onu da unutmamalıdırlar ki, keçmişin irsindən qorxmağa, yaxud ehtiyatlanmağa lüzum yoxdur. Onu olduğu kimi qəbul edib öyrənmək, müsbət tərəflərini və qüsurlarını obyektiv şəkildə göstərmək və ədalətli qiymətləndirmə əsasında ictimaiyyətə ötürmək lazımdır".




Professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, zəngin arxiv materialları, mühüm tarixi qaynaqlar, hərtərəfli müqayisə, dərin təhlillər əsasında yazılmış bu əsər tarixşünaslığımıza böyük töhfədir.

ADPU-nun Tarix və coğrafiya fakültəsinin Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Oqtay Sultanov çıxışında bildirib ki, əsərin elmi, siyasi, fəlsəfi əhəmiyyəti böyükdür. Akademik Ramiz Mehdiyevin alim və vətəndaş mövqeyini əks etdirən "Tariximizin xanlıqlar dövrünün siyasi irsi sənədlər işığında" kitabı tarixşünaslığımızda hadisədir. Müəllif ilk dəfə olaraq həmin dövrü siyasi və tarixi nöqteyi-nəzərdən mahiyyətcə yeni kontekstdə təhlil edib, bir çox qaranlıq məqamlara aydınlıq gətirərək, onilliklər ərzində formalaşmış stereotipləri qırmağa çalışıb. Eyni zamanda tarixşünaslığımızın həmin dövrlə bağlı aktual problemlərinə toxunaraq onların optimal həll yollarını göstərib.

Professor Oqtay Sultanov qeyd edib ki, sözügedən kitab Azərbaycan tarixinin ən ağrılı və həssas mərhələlərindən sayılan xanlıqlar dövrünün indiyədək tarixşünaslığımıza məlum olmayan siyasi sənədlər əsasında qiymətləndirilməsi istiqamətində atılmış mühüm elmi addımdır. Müəllif xanlıqlar dövrünün indiyədək ciddi elmi mübahisələrin predmeti olan bir sıra mühüm problemlərinə, hadisə və şəxsiyyətlərə faktlar və etibarlı elmi mənbələr, arxiv sənədləri əsasında münasibət bildirir, həmin tarixi mərhələyə obyektiv qiymət verməyə mane olan məsələlərə aydınlıq gətirir. Nəşrdə təqdim edilən, müvafiq şərh və izahlarla müşayiət olunan sənədlər xanlıqlar dövrünün real mənzərəsinə aydınlıq gətirmək baxımından böyük əhəmiyyətə malikdir. Azərbaycan gəncliyi bu əsəri dərindən mənimsəməlidir. Çünki əsərdə xanlıqlar dövrünün hadisələri müasir dövrlə əlaqələndirilir. Bu kitabı diqqətlə oxusaq və XX əsrin 90-cı illər Azərbaycan tarixinə nəzər salsaq, tarixi hadisələrin səsləşdiyinin şahidi olarıq. Ancaq xanlıqlar dövründən fərqli olaraq 1993-cü ildə ulu öndər Heydər Əliyevin yenidən hakimiyyətə gəlməsi Azərbaycanı parçalanmaq təhlükəsindən xilas etdi.

ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov, Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova çıxışlarında bildiriblər ki, akademik Ramiz Mehdiyevin tədqiqatları, dərin məntiqə söykənən fikir və mülahizələri, dəyərli tövsiyələri, həmçinin təqdim etdiyi qiymətli sənədlər xanlıqlar dövrünə aid bir çox yanlış yanaşma və şərhləri aradan qaldırmağa imkan yaradacaq. Bununla yanaşı, Azərbaycan tarixşünaslığında, ictimai fikrində məsələyə münasibətdə daha sistemli və obyektiv baxışın formalaşmasına təkan verəcək.

Qeyd edək ki, kitab həm peşəkar tarixçilər və mənbəşünaslar, həm də Azərbaycan tarixi ilə maraqlanan oxucular üçün nəzərdə tutulur.

**Mənsur Qüdrətoğlu**

# "Yeni texnologiyalar və tədris prosesinin idarə olunması" Magistrantların II Respublika elmi konfransı

Aprelin 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Yeni texnologiyalar və tədris prosesinin idarə olunması"Magistrantların II Respublika elmi konfransı öz işinə başlayıb. Qeyd edək ki, konfrans Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 9 aprel 2018-ci il tarixli Sərəncamı ilə təsis edilmiş "Elm günü"nə həsr olunub. Məlumat üçün bildirək ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərov bu konfransla bağlı müvafiq əmr imzalayıb. Əmrdə konfransın yüksək səviyyədə keçirilməsi məqsədi ilə universitetdə 9 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Konfransda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, ali təhsil müəssisələrinin məsul şəxsləri iştirak ediblər.



Konfransı giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra ölkəmizin ictimai-siyasi, sosial-iqtisadi və elmi-mədəni həyatında böyük keyfiyyət dəyişiklikləri baş verdi. Təhsil sahəsi də sürətli inkişaf yoluna qədəm qoydu. "Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir" deyən müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyevin rəhbərliyi ilə təhsil sahəsinin qanunvericilik bazası təkmilləşdirildi, normativ-hüquqi sənədləri hazırlandı, maddi-texniki baza gücləndirildi, təhsilin keyfiyyəti yüksəldi. Ulu öndər Heydər Əliyev yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadrların hazırlanmasına xüsusi diqqət yetirirdi. Ulu Öndərimizin "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram" kəlamı fəaliyyətimizin leytmotivini təşkil edir.




Böyük dövlət xadimi Heydər Əliyevin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev elm və təhsilin inkişafına xüsusi diqqət və qayğı göstərir. Ölkəmizin böyük iqtisadi potensialı elm və təhsilin inkişafında mühüm rol oynayır. Bu qayğı və diqqətdən ruhlanan ADPU elm və təhsilimizin inkişafına öz töhfələrini verir. Aparılan islahatlar, həyata keçirilən yeniliklər, layihələr ADPU-nun yeni inkişaf mərhələsinə daxil olmasına şərait yaradıb. 2021-ci ildə ADPU-nun yaradılmasının 100 ili tamam olur. Biz əldə edilmiş uğurlarla kifayətlənməməli, fəaliyyətimizi müasir dünyanın çağırışlarına uyğun qurmalıyıq. Bu baxımdan magistrantlarımızın üzərinə böyük məsuliyyət düşür. Magistrantlarımız daim öz üzərlərində çalışmalı, bilik və bacarıqlarını artırmalı, rəqəmsal bilikləri, dünyanın aparıcı xarici dillərini dərindən öyrənməli, vətənpərvər olmalıdırlar. Hazırda ADPU-da 17 ixtisas, 18 ixtisaslaşma üzrə 707 nəfər magistr təhsili alır. Bugünkü konfransda Bakı Dövlət Universitetinin, Lənkəran Dövlət Universitetinin, Odlar Yurdu Universitetinin və digər universitetlərin magistrantları iştirak edirlər. Konfransa 503 nəfər magistrant məqalə təqdim edib. Ötən illə müqayisədə bu 2 dəfə çoxdur. Rektor çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxışında qeyd edib ki, müasir dünyamızda dövlətlərin gücü onların elmi səviyyəsi ilə müəyyən edilir. Dövlət başçımız İlham Əliyevin müvafiq Sərəncamı ilə ölkəmizdə "Elm günü"nün təsis edilməsi elmin inkişafı üçün stimul yaradır.Son illər ADPU-da elmi-tədqiqat işlərin səviyyəsi yüksəlib, professor-müəllim heyətinin impakt-faktorlu jurnallarda dərc edilən elmi məqalələrinin sayı artıb, alimlərimiz müxtəlif respublika və beynəlxalq miqyaslı elmi toplantılarda fəal iştirak edirlər. Universitetdə elmi fəaliyyətin biznes tərəfinə ciddi diqqət yetirilir. ADPU Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun 5 qrant layihəsini qazanıb. Eyni zamanda gənclərin elmi fəaliyyətə cəlb edilmələrinə xüsusi önəm verilir. Bugünkü konfrans ADPU-da magistrantların sayca 2-ci respublika elmi konfransıdır. Ötən illə müqayisədə bu konfransda həm kəmiyyət, həm də keyfiyyət baxımından dinamika müşahidə edilir. ADPU-da son 3 ildə dissertasiya işləri yüksək səviyyədə müdafiə edilir. Professor A. Zamanov çıxışında ADPU-da keçirilən elmi tədbirlər barədə də geniş məlumat verib.

Odlar Yurdu Universitetinin rektoru, professor Əhməd Vəliyev, Bakı Dövlət Universitetinin Elm və innovasiyalar üzrə prorektoru, AMEA-nın müxbir üzvü, professor Aydın Kazımzadə, Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin Elm və texnika işləri üzrə prorektoru, dosent Rauf Əliyarov konfransın yüksək səviyyədə təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər və konfransın işinə uğurlar arzulayıblar. Çıxışlarda qeyd edilib ki, ADPU ölkəmizin taleyində böyük rol oynayıb. Xalqın, millətin varlığı auditoriyalardan, müəllimlərdən başlayır. Bu mənada müəllim hazırlığı ilə məşğul olan ali təhsil müəssisələrinin üzərinə mühüm vəzifələr düşür. Gənclərimiz ənənəvi və yeni dəyərləri dərindən mənimsəməli, yüksək səviyyəli mütəxəssis kimi yetişməlidirlər.

Magistrant Abdulxaliq Məmmədli "Məktəb idarəçiliyində sistem liderliyi" mövzusunda, magistrant Aysel Cəlallı "Riyaziyyat dərslərində əyləncəli və maraqlı çalışmalar vasitəsilə şagirdlərin idraki maraqlarının formalaşdırılması yolları" mövzusunda çıxışlar ediblər.

Sonra konfrans öz işini 4 elmi bölmədə-İnnovasiyalar və təhsilin keyfiyyəti,Təhsilin təşkili və idarə edilməsi, Təhsildə sosial-psixoloji problemlər və Tədrisin müasir problemləri bölmələrində davam etdirib. Bölmə iclaslarında məruzələr müzakirə edilib, fikir mübadiləsi aparılıb, təkliflər səsləndirilib.

Qeyd edək ki, 2 gün davam edən konfrans aprelin 19-da başa çatıb. Konfransın yekun iclasında bölmə rəhbərlərinin hesabatları dinlənilib, müvafiq qərarlar qəbul edilib.

**Mahirə Məhərrəmqızı**



# İbtidai təhsil fakültəsində akademik Mehdi Mehdizadəyə həsr olunmuş elmi seminar

Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində "Elm günü"nə həsr olnmuş "Görkəmli təhsil təşkilatçısı akademik Mehdi Mehdizadə" mövzusunda elmi seminar keçirilib.




Seminarı fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov açaraq akademik Mehdi Mehdizadənin həyatı və yaradacılığı haqqında ətraflı məlumat verib.

Sonra İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının magistrantları Sevinc Əsgərli "Akademik Mehdi Mehdizadənin yaşadığı dövr", Günay Əliyeva və Kamran Məmmədov "Akademik Mehdi Mehdizadənin həyatı", Elza Ələkbərova və Rabiyyə Qədirli "Akademik Mehdi Mehdizadənin yaradıcılığı", Sevinc Bəşirova və Adilə Mazakova "Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti", Əfsanə Əsgərova "Akademik Mehdi Mehdizadənin əsərləri", Nərmin Yusifova və Fəridə Fətullayeva "Akademik Mehdi Mehdizadənin "Ümumtəhsil məktəblərinin təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi" monoqrafiyası", Sevda Ağayeva "Akademik Mehdi Mehdizadə Azərbaycan Respublikasının maarif naziri kimi" mövzularında məruzələr ediblər.

# Professor Fikrət Xalıqovun 70 illik yubileyinə



Alqış, şanlı ömrün yetmiş ilinə,
Səksəni, doxsanı gətir dilinə.
Əli Zülfüqarı keçə əlinə,
Qudurğan qafalar üzəsən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Sənin dərya qəlbin durudan duru,
Möcüzə yaratdı ağlının nuru.
Elmin yollarında çala-çuxuru
Çevirdin göz oxşar düzə sən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Səni ucuz şöhrət salmadı bəndə,
Səni duya bilməz hər naşı bəndə.
Ağlının, qəlbinin şərhi gələndə,
Sığmırsan deyimə, sözə sən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Həmişə gur yansın bəxtinin şamı,
Çin olub gül açsın qəlbinin kamı.
Əlindən düşməyə Cəmşidin camı,
Bizim qədəhə də süzəsən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Boşlar ibrət kimi görsün dolunu,
Səksəndə davam et gənclik yolunu,
Doxsanında qanad edib qolunu,
Nəticə toyunda süzəsən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Oyun bil dünyanın qeylü-qalını,
Saçın qara dönsə, pozma halını,
Kötükcə əlindən "Yaş" medalını,
Duyğulu sinənə düzəsən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

Haqla, doğruluqla yoğrulub mayan,
Çovğun olsa, sinəni gər, mərd dayan,
Üç rəqəmli yaşında sən vurul, yan,
Gərək bu cəfaya dözəsən, Fikrət!
Yüzü keç, keç təzə yüzə sən, Fikrət!

**Məhərrəm Hüseynov,**
**filologiya üzrə elmlər doktoru, dosent**

# Riyaziyyat və informatika fakültəsində elmi-innovativ seminar



Aprelin 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində elmi-innovativ seminar keçirilib. Seminarda Riyaziyyat və informatika fakültəsinin professor-müəllim heyəti iştirak edib.

Seminarı giriş sözü ilə fakültənin dekan müavini, dosent Allahverdi Cəfərov açıb və seminarın işinə uğurlar arzulayıb. Sonra "Orta məktəbdə riyaziyyat dərslərində tarixi məlumatların istifadə metodikası" mövzusunda məruzə ilə çıxış etmək üçün söz Riyaziyyat və onun tədrisi metodikası kafedrasının baş müəllimi Solmaz Həsənovaya verilib. Baş müəllim Solmaz Həsənova mövzu ilə bağlı geniş və ətraflı çıxış edib, sualları cavablandırıb. Onun məruzəsi iştirakçılar tərəfindən maraqla qarşılanıb.



Sonda mövzu ətrafında geniş müzakirə aparılıb, maraqlı fikir və təkliflər səsləndirilib.

# Elmi Şuranın iclası

Aprelin 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə "İnsan resursları şöbəsinin fəaliyyəti haqqında", "ADPU-nun Fizika və texnologiya fakültəsinin fəaliyyəti haqqında" və cari məsələlər daxildir.

İclasda rektor Cəfər Cəfərov Fizika və texnologiya fakültəsinin Fizikanın tədrisi metodikası kafedrasının dosenti İsa İsmayılova Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının müvafiq qərarı ilə təsdiq edilmiş professor elmi adının attestatını, həmçinin SABAH qruplarının tələbələrinin Bakı Dövlət Universitetinin 100 illik yubileyinə həsr olunan Müəllimlik üzrə Bilik Yarışmasında II yeri tutmuş ADPU-nun SABAH qrupunun tələbəsi Çərkəz Kərimovaya sertifikat təqdim edib.

Rektor çıxışında qeyd edib ki, son vaxtlar Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sosial sahə ilə bağlı imzaladığı sərəncamlar və fərmanlar, qəbul etdiyi qərarlar aztəminatlı ailələrdən olan tələbələrin də sosial vəziyyətinin yaxşılaşmasına müsbət təsir edir. ADPU 1340 əlavə təqaüd yeri alıb. Həmçinin Azərbaycan Respublikasının Gənclər Fondu da bu təbəqədən olan tələbələrin sosial vəziyyətini yaxşılaşdırmaq üçün tədbirlər gerçəkləşdirir. Biz orta məktəblərlə əlaqələri genişləndirməli, xüsusilə də, şagirdlər üçün psixoloji xidmətin təşkili sahəsində məktəblərlə sıx əməkdaşlıq etməliyik. Azərbaycan rəhbərliyinin strateji kursu ölkənin müasirləşməsidir. Biz öz müsbət fəaliyyətimizlə bu strateji kursa dəstək verməliyik. Müasir dövrümüzdə universitetlərin hədəfi, missiyası dəyişib. Universitetlər insan kapitalının inkişaf etdirilməsində əsas rol oynamalıdırlar. Universitetlər tədris və elmi-tədqiqat fəaliyyəti ilə məşğul olmaqla bərabər, mədəniyyət mərkəzi olmalıdırlar. Biz bunun üçün əzmlə, fədakarlıqla çalışmalıyıq.

"İnsan resursları şöbəsinin fəaliyyəti haqqında" şöbənin müdiri Qumral Qədimova məlumat verib. Qumral Qədimova bildirib ki, ADPU-nun 11 iyul 2016-cı il tarixli Elmi Şurasının qərarı ilə universitetin yeni strukturu və ştat cədvəli təsdiq olunub və mövcud olan ştat cədvəlinə dəyişikliklər edilib. Hazırda universitetdə 8 fakültə, 35 kafedra fəaliyyət göstərir. "Azərbaycan Dövlət Pedaqoji Universitetinin daxili fəaliyyət qaydaları"na əsasən idarəetmə və tədrisin keyfiyyətinin yüksəldilməsi məqsədilə bir sıra islahatlar həyata keçirilib. Əvvəlki ştat cədvəlində olan 69 nəfər kitabxanaçı ştatı 30 nəfərə, kafedralarda fəaliyyət göstərən 207 laborant və böyük laborant ştatı isə 143-ə endirilib. AMİ-nin ADPU-ya qoşulması ilə əlaqədar olaraq 96 nəfər professor-müəllim heyəti, 76 nəfər tədris-köməkçi heyəti və 40 nəfər Xidmət Şöbəsindən, bütövlükdə 212 nəfər işçi mövcud qanunvericiliyə uyğun olaraq ADPU-da işlə təmin edilib. Tədrisin keyfiyyətinin yüksəldilməsi və müasir standartlara uyğunlaşdırılması üçün müəllimlərin işə qəbulu yeni prosedurla - müsabiqə yolu ilə həyata keçirilir. Yeni qaydalarda əsas məqsəd professor-müəllim heyətinin tədris və elmi fəaliyyətini gücləndirmək, ədalətli rəqabət mühiti yaratmaqdır. Hazırda 200-dək vakant professor-müəllim üçün 29 mart 2019-cu il tarixində "Azərbaycan müəllimi" qəzetində elan, eyni zamanda ADPU-nun saytında yerləşdirilib. Bugünədək 290 nəfər şəxs sənədlərini İnsan resursları şöbəsinə təqdim edib. Sənəd qəbulu aprelin 29-da bitəcəkdir.

Təhsil nazirinin 9 mart 2011-ci il tarixli 400 nömrəli əmri ilə təsdiq edilmiş "Ali təhsil müəssisələrində kafedra müdiri, dekan və dekan müavini vəzifələrinin tutulması





qaydaları"nı rəhbər tutaraq "Xalq qəzeti" və "Azərbaycan müəllimi" qəzetlərində fakültə dekanı və kafedra müdiri vəzifələri üzrə müsabiqələr keçirilib. 2017-ci ildə 4 fakültə dekanı, 14 kafedra müdiri müsabiqə yolu ilə müvafiq vəzifələrə təyin olunublar. 14.12.2018-ci ildə verilən növbəti elana əsasən 6 nəfər müvafiq kafedralara seçilərək müdir təyin edilibər.

Azərbaycan Respublikası Prezidentinin "Gender (kişi və qadınların) bərabərliyinin təminatları" ilə bağlı 7 may 2008-ci il tarixli Sərəncamının nəticəsi olaraq 2016-ci illə müqayisədə hazırda ADPU-da 32 qadın struktur rəhbəri təyin edilib. Qeyd edək ki, 20 nəfər qadın rəhbər 2016-cı ildən sonra təyin olunub. Universitetdə kadrların gəncləşdirilməsi məqsədilə ADPU-nu fərqlənmə diplomu ilə bitirmiş magistr, doktorant, dissertantlar və eyni zamanda xaricdə təhsil almış peşəkar gənclərin işə cəlb olunması nəzərdə tutulub. İnzibati vəzifələrin tutulması üzrə Müsabiqə Komissiyası yaradılıb və vakant vəzifələr üzrə müsabiqə elan edilib. Müsabiqə barədə ilk elan 9 oktyabr 2017-ci il tarixdə "Azərbaycan müəllimi" qəzetində, eyni zamanda ADPU-nun saytında yerləşdirilib. Həmin vaxtdan bugünədək 7 dəfə müsabiqə elan edilib. Vakant vəzifələrin tutulması üçün verilmiş elanlara əsasən İnsan resursları şöbəsi tərəfindən ümumilikdə 281 nəfər namizədin sənədi qəbul edilib. Onlardan 64 nəfəri müxtəlif vəzifələrə seçilərək işlə təmin ediliblər. İşlə təmin olunan 64 nəfərin 44 nəfəri ADPU-nun məzunlarıdır. Məhz bu cür əməkdaşların sayəsində ADPU-nun kadr heyətinin peşəkarlıq qabiliyyətini yaxşılaşdırmaq, idarəetmə sistemini təkmilləşdirmək, tədrisin keyfiyyətini yüksəltmək, müasirləşdirmək və bütövlükdə universitetin hərtərəfli inkişafına yönələn tədbirləri davam etdirmək nəzərdə tutulub.

Universitetin professor-müəllim heyətinin müasir dövrün tələblərinə uyğun motivasiya sisteminin qurulması üçün Reytinq Qiymətləndirmə sistemi yaradılıb, 2018-ci maliyyə ilinin nəticələrinə əsasən reytinq qiymətləndirməsi aparılıb və ən yaxşı nəticə toplamış 100 nəfər müəllimin aylıq əməkhaqqına 100 manat əlavə hesablanmasına qərar verilib. Həmçinin ADPU-nun müəllimlərinin bacarıqlarının artırılması istiqamətində universitet bir çox layihələr həyata keçirib və bu iş hazırda da davam edir. Əməkdaşların əmək hüquqlarının və əmək intizamının qorunması istiqamətində də işlər davam etdirilir. İnsan resurslarının idarə olunmasının optimallaşdırılması və müasir dövrün tələblərinə uyğunlaşdırılması üçün bəzi iş istiqamətləri üzrə xidmətlərin şirkətlər tərəfindən həyata keçirilməsi yolu ilə heyətin peşəkarlığı və intizamı artırılıb. Əməkdaşların əmək intizamının artırılması, əmək öhdəliklərinin vaxtında və qüsursuz icra edilməsi üçün İntizam Komissiyası fəaliyyət göstərir və inzibati tənbeh tədbirləri görülür.

Q.Qədimova çıxışının sonunda qeyd edib ki, qarşıdan gələn dövrdə professor-müəllim və tədris-köməkçi heyətin qanunvericiliyin tələblərinə uyğun olaraq komplektləşdirilməsi üçün sistemli tədbirlər davam edəcəkdir. Xüsusilə kafedraların dərs yükünə uyğun olaraq tədris-köməkçi heyətin sayının uyğunlaşdırılmasına, tyutorların sayının tədricən universitet tərəfindən təşkil olunmağa başlamış tyutorluq kursunu uğurla bitirmiş müdavimlər hesabına artırılmasına, xarici dil və kompüter bilikləri yüksək olan gənclərin işə cəlb olunmasına, əməkdaşların universitetdəki fəaliyyətinə görə əməkhaqqı siyasətinin təkmilləşdirilməsinə, professor-müəllim heyətinin daha da gücləndirilməsi işlərinə diqqət artırılacaqdır.

Elmi Şura Q.Qədimovanın hesabatını qəbul edib.

"ADPU-nun Fizika və texnologiya fakültəsinin fəaliyyəti haqqında" hesabatla çıxış edən fakültənin dekanı, dosent Arzu Daşdəmirov qeyd edib ki, fakültədə 3 kafedra-Ümumi fizika kafedrası, Fizikanın tədrisi metodikası kafedrası, Texnologiya və onun tədrisi metodikası kafedrası və 1 elmi-tədqiqat laboratoriyası- Nadir torpaq materialları fizikası elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir. Hazırda fakültədə 79 nəfər çalışır. Onlardan 52 nəfəri professor-müəllim heyəti, 27 nəfəri isə tədris-köməkçi heyətidir. 1 professor Əməkdar müəllimdir. Fakültədə ali təhsilin bakalavriat səviyyəsində 2 ixtisas üzrə-"Fizika müəllimliyi" ixtisası və "Texnologiya müəllimliyi" ixtisası üzrə kadr hazırlığı aparılır. "Fizika müəllimliyi" ixtisasında 368 nəfər tələbə, "Texnologiya müəllimliyi" ixtisasında 299 nəfər, ümumilikdə 667 nəfər tələbə təhsil alır. 2018-2019-ci tədris ilində fakültəyə ali təhsilin magistratura səviyyəsində 19 nəfər magistr qəbul olunub. Hazırda fakültədə 37 nəfər magistr təhsili alır. Fakültədə şəffaf və obyektiv təhsil mühitinin yaradılması, tədrisin keyfiyyətinin yüksəldilməsi, yeniliyin və müasirliyin təmin edilməsi, qabaqcıl beynəlxalq təcrübənin öyrənilərək tətbiq olunması, müasir əmək bazarının tələblərinə cavab verən rəqabətqabiliyyətli mütəxəssislərin hazırlanması əsas vəzifələrdir. Fakültədə universitetdə ilk dəfə olaraq Eksperimental qruplar yaradılıb. Onlara tədris planında nəzərdə tutulan fənlərdən əlavə STEM, Science, Engeenering, xarici dillər də tədris olunur. Fakültədə həmçinin Praktik Bacarıqlar Mərkəzi yaradılıb.Fakültənin tarixində ilk dəfə olaraq Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun keçirdiyi "Elm-Təhsil İnteqrasiyası" məqsədli qrant müsabiqəsində fakültənin əməkdaşlarının AMEA-nın Fizika İnstitutu ilə birlikdə təqdim etdikləri "Kationları nadir torpaq elementləri ilə qismən əvəz edilmiş mis xalkogenidlərinin quruluş və dielektrik xassələrinə qamma-şüalanmanın təsiri" mövzulu layihə qalib layihələr sırasındadır.

Fakültədə tədris-metodiki, elmi və tələbələrlə işin mövcud vəziyyəti və inkişaf perspektivləri haqqında geniş məlumat verən dekan A.Daşdəmirov qeyd edib ki, fakültənin inkişaf strategiyasında fakültənin tamamilə yeni strateji planının hazırlanması, konkret məqsədlərin, real hədəflərin müəyyən olunması, gələcək dövrün tələblərinə cavab verə biləcək mütəxəssis hazırlığını təmin edən yeni standartların tətbiqi, təhsil proqramları, eləcə də tədris materiallarının məzmununun müasir dövrün tələblərinə uyğun olaraq yenilənməsi və təkmilləşdirilməsi, müasir dövrün tələbatlarına və dünyanın inkişaf etmiş ölkələrinin təcrübələrinə uyğun olaraq hər bir ixtisas üzrə standartların yenidən hazırlanması, təkmilləşdirilməsi və qabaqcıl beynəlxalq təcrübə əsasında pedaqoji kadr hazırlığı üzrə müasir tədris planlarının hazırlanması, tədris planlarına STEM dərslərinin daxil edilməsi, gələcəkdə fakültədə STEM ixtisaslı mütəxəssis hazırlığının təşkili, müasir tələblərə cavab verən təhsil infrastrukturunun yaradılması nəzərdə tutulur. Eyni zamanda elmi-tədqiqatların məzmununun müasir dövrün tələblərinə uyğun müəyyən edilməsi və keyfiyyətinin artırılması, o cümlədən aparılan elmi-tədqiqatlar ilə tədris prosesinin əlaqələndirilməsi, fakültənin beynəlxalq əlaqələrinin inkişaf etdirilməsi, tələbələrin və professor-müəllim heyətinin mübadilə proqramlarında iştiraklarının təmin edilməsi, akademik heyətin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistemin yaradılması, müasir tələb və texnologiyalar əsasında, fakültənin müsbət ənənələrini qoruyaraq tədris sisteminin kompleks modernləşdirilməsi, əmək bazarının tələbatının monitorinqi və buna uyğunlaşdırılmış qəbul planlarının müəyyənləşdirilməsi, kadr potensialının inkişafı, intellektual mühitin yaxşılaşdırılması, müasir təhsil tələblərinə, elmi fəaliyyətə və sosial-mədəni tələblərə cavab verən fakültə infrastrukturunun yaradılması, səmərəli idarəçiliyin təmin edilməsi, gənclərin innovativ yaradıcılıq mərkəzlərinin yaradılması, mütəxəssislər və yeni başlayanlar üçün distant təlimlərin keçirilməsi, müxtəlif tədris, elmi-texniki və treninq informasiya mərkəzləri yaratmaqla, innovativ layihələrin dəstəklənməsi fakültənin inkişaf strategiyasının başlıca istiqamətləri kimi müəyyən edilib. Fakültənin missiyasına müasir keyfiyyət standartları əsasında fizika müəllimliyi və texnologiya müəllimliyi ixtisasları üzrə pedaqoji təhsil sahəsində respublikada liderliyin ələ alıınması,əmək bazarında tələb olunan yüksəkixtisaslı, səriştəli mütəxəssis hazırlığı, tədrisin səmərəsini yüksəltməklə fakültəyə keyfiyyətli tələbə heyətinin cəlb edilməsi daxildir. Fakültənin hədəfləri isə baza kafedralarında müxtəlif ixtisaslaşmalar üzrə magistr hazırlığını bərpa etmək, fizika ixtisası üzrə bakalavr hazırlığının yenidən bərpası, tədrisi ingilis dilində olan qrupların formalaşdırılmasına nail olmaq, müxtəlif qrant layihələrinə qoşulmaqla elmi-tədqiqat fəaliyyətinin inkişafını təmin etmək, STEM müəllimliyi ixtisasının yaradılmasına nail olmaq, qoşa ixtisaslarda mütəxəssis hazırlığını təşkil etməkdir.

Dekan A.Daşdəmirov hesabat məruzəsində təlim-tərbiyə və tələbələrlə iş, ictimai fəaliyyət barədə də geniş məlumat verib. Çıxışının sonunda A.Daşdəmirov tədris prosesinin müasir tələblərə cavab verən şəkildə qurulması üçün təkliflər irəli sürüb.

Fizika və texnologiya fakültəsində aparılmış monitorinqin nəticələri barədə Monitorinq qrupunun rəhbəri, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib.

Elmi Şura dosent A. Daşdəmirovun hesabatını qəbul edib.

Professor Nizami Xudiyev, professor Malik Cəbrayılov, professor Himalay Qasımov, professor Zahid Xəlil, professor İramin İsayev, professor Nailə Verdizadə, dosent Şahin Pənahov, dosent Gülçöhrə Alıyeva və başqaları tədris prosesinin daha səmərəli qurulması, tədris planlarının təkmilləşdirilməsi və xarici dillərin tədrisinin səviyyəsinin yüksəldilməsi üçün təkliflərlə çıxış ediblər.

Cari məsələlərin müzakirəsi zamanı Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov ADPU-da professor-müəllim heyətinin seçki müsabiqəsində iştirak edəcək iddiaçıların fəaliyyətini qiymətləndirmə meyarları, ADPU və filiallarda fakültə elmi şuralarının formalaşdırılması ilə bağlı Təhsil Nazirliyində 13 sentyabr 2018-ci il tarixində keçirilmiş Kollegiya iclasında təsdiq edilmiş "Ali təhsil müəssisəsinin fakültə Elmi Şurası haqqında Əsasnamə"nin tətbiq edilməsi haqqında, ali təhsil müəssisələrində əlavə təqaüd yerlərinin bölgüsü barədə, ADPU-da təşkil olunan tədbirlərin əlaqələndirilməsi və infrastrukturdan səmərəli istifadə olunması barədə, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov ADPU-da "Tyutor (akademik məsləhətçi) hazırlığı" kurslarının təşkili Qaydaları barədə, elmlər doktoru və fəlsəfə doktoru proqramı üzrə dissertasiya mövzularının və elmi rəhbərlərin təsdiqi barədə, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələrinə əsasən adlı təqaüdə layiq görülmüş namizədlərin təsdiqi haqqında, Keyfiyyətin təminatı şöbəsinin müdiri Rəşad Sadıqov ADPU-da reytinq qiymətləndirməsinin nəticələrinə əsasən müxtəlif nominasiyalar üzrə təltifetmənin keçirilməsi haqqında məlumat veriblər. Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

**Günay Ramizqızı**

# Tarix və coğrafiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası

Aprelin 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. Fakültənin inzibati heyətinin və professor-müəllim heyətinin əksəriyyətinin iştirakı ilə Elmi Şuraya gizli səsvermə keçirilib.



İclası giriş sözü ilə açan universitetin Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov tədbir iştirakçılarını salamlayaraq universitetin son illərdəki uğurlarıından, rector, professor Cəfər Cəfərovun rəhbərliyi ilə aparılan islahatların əhəmiyyətindən danışıb, universitetin, o cümlədən fakültələrin idarə edilməsində Elmi Şuranın mühüm əhəmiyyət daşıdığını vurğulayıb.

Bildirilib ki, "Ali təhsil müəssisəsinin fakültə Elmi Şurası haqqında Əsasnamə"nin tələblərinə görə fakültəyə ümumi rəhbərlik seçkili orqan olan dekanın sədrlik etdiyi fakültə Elmi Şurası tərəfindən həyata keçirilir. Fakültə Elmi Şurası fakültədə mütəxəssis hazırlığına, fakültənin elmi-tədqiqat fəaliyyətinə və kafedraların maddi-texniki təchizatı ilə bağlı məsələlərə baxır, fakültənin dekanını seçir və müəyyən olunmuş qaydada professor-müəllim heyətinin vəzifələrini tutmaq üçün müsabiqələr keçirir, tədris planlarının və proqramlarının layihələrinin, kafedraların tədris-metodiki və elmi-tədqiqat işləri haqqında hesabatlarını dinləyib müzakirə edir, elmi-tədqiqat və tərbiyə işlərinin planlarını müzakirə edir, fakültənin fəaliyyəti ilə bağlı olan bir sıra məsələlərə baxır.

Professor A.Zamanov qeyd edib ki, fakültə Elmi Şurası ali təhsil müəssisəsinin rəhbərinin əmrinə əsasən 3 il müddətinə seçilir. Fakültənin Elmi Şurasına tutduqları vəzifələrinə görə dekan müavinləri, fakültənin tərkibindəki bütün kafedraların müdirləri, fakültə tələbə təşkilatlarının sədrləri ilə yanaşı, digər üzvləri fakültənin professor-müəllim heyətinin ümumi iclasında gizli səsvermə yolu ilə seçilir. Tarix və coğrafiya fakültəsinin Elmi Şurasının tərkibi 2016-cı ilin aprel ayında təsdiq olunduğuna görə artıq şuranın fəaliyyətinin başa çatması yeni tərkibin seçilməsini zəruri edir.

Universitet Elmi Şurasının sonuncu iclasında fakültə şurasına seçiləcək üzvlərin sayının fakültənin professor-müəllim heyətinin 10 faizindən ibarət olması qəbul edilib. Buna görə də professor-müəllim heyətinin 114 nəfərdən ibarət olduğunu nəzərə alaraq 11 nəfərin gizli səsvermə yolu ilə seçiləcəyi diqqətə çatdırılıb. 14 nəfər isə fakültədə tutduğu vəzifəsinə görə fakültə Elmi Şurasının tərkibinə daxil edilir.

Sonra 3 nəfərdən ibarət Hesablayıcı komissiya yaradılıb və o, öz işinə başlayıb. İclasda iştirak edənlərin hər birinə seçki bülletenləri təqdim edilib və gizli səsvermə keçirilib. Daha sonra bülletenlər komissiya tərəfindən hesablanıb və nəticə komissiya tərəfindən elan edilib.

İclasın sonunda professor A.Zamanov fəal iştirakına görə professor-müəllim heyətinə təşəkkür edib və fakültə Elmi Şurasının yeni tərkibini təbrik edib və uğurlar arzulayıb.

# Azərbaycanlıların soyqırımı: tarixi gerçəklik

Azərbaycan Respublikası müstəqilliyini bərpa etdikdən sonra tarixi keçmişimizi daha yaxşı öyrənmək imkanı əldə edilmiş, uzun illər gizli qalan həqiqətlər tədricən üzə çıxmış, beləliklə, təhrif edilmiş hadisələr aşkarlıq müstəvisində daha aydın görünməyə başlamışdır. Xalqımıza qarşı zaman-zaman törədilmiş və beynəlxalq miqyasda heç vaxt tarixi qiymətini almamış soyqırımı hadisələri də bu qəbildəndir.

XIX əsrin əvvəllərindən başlayaraq, tarixi Azərbaycan torpaqları olan Qarabağa, Naxçıvana, Zəngəzura, İrəvan quberniyasına və digər bölgələrə İran və Türkiyədən minlərlə erməni ailəsi köçürülmüşdür. Erməni millətçilərinin və onların havadarlarının azərbaycanlılara qarşı iki əsrdən artıq müddətdə məqsədyönlü şəkildə həyata keçirdikləri soyqırımı, etnik təmizləmə və deportasiya siyasətinin məqsədi soydaşlarımızı öz tarixi torpaqlarından qovmaq və bu ərazilərdə "Böyük Ermənistan" dövləti yaratmaq olmuşdur.

Bu qanlı faciələrin daha dəhşətlisi 31 mart 1918-ci il tarixdə azərbaycanlılara qarşı törədilən soyqırımdır və özünün ağır nəticələri ilə seçilir. Belə ki, 1917-ci ilin Fevral inqilabı və Oktyabr çevirilişindən məharətlə istifadə edən ermənilər öz çirkin iddialarını bolşevik bayrağı altında reallaşdırmağa nail oldular.

1918-ci ilin mart ayından etibarən erməni millətçiləri tərəfindən dinc azərbaycanlı əhali yalnız milli mənsubiyyətinə görə məhv edilmiş, insanlar diri-diri yandırılmış, nadir tarixi abidələr, xəstəxanalar, məktəblər, məscidlər dağıdılmışdır.

Silahlı erməni-bolşevik birləşmələrinin Bakıda 31 Mart və 1-2 aprel 1918-ci il tarixlərində törətdiyi qırğınlar kütləvi şəkil almış, erməni dəstələri günahsız insanları amansızcasına qətlə yetirmişlər. Həmin soyqırımın davam etdiyi dövrdə ölkəmizin ərazisində 100 minlərlə azərbaycanlı, o cümlədən Bakı və ətraf kəndlərin 30 mindən çox sakini milli mənsubiyyətinə görə qəddarlıqla öldürülmüşdür. Bu zaman ermənilər bir çox qədim binaları, o cümlədən dünya memarlığının incilərindən sayılan İsmailiyyə binasını, ziyarətgahları top atəşinə tutaraq dağıtmış, Cümə və Təzəpir məqsədlərinin minarələri ağır zədə almış, habelə karvansarada vəhşicəsinə öldürülmüş insanların meyitlərini elə oradaca yandırmışdılar.

Azərbaycanlıların soyqırımı əsasən Bakı, Şamaxı, Quba, Kürdəmir və Salyan qəzalarında, Qarabağ, Zəngəzur, Naxçıvan və Lənkəranda xüsusi qəddarlıqla həyata keçirilmişdir. Mart hadisələri zamanı Şamaxının 75 kəndi ermənilər tərəfindən tamamilə məhv edilmiş, 7 min nəfər öldürülmüşdür. Şamaxı şəhəri və ona qonşu olan kəndlərdə törədilmiş soyqırımı hadisələri haqqında bu gün arxivlərdə külli miqdarda materialların olması bu bölgədə baş vermiş faciələrin miqyasını bir daha göstərir. Tarixi mənbələrdə qeyd olunduğu kimi, Şamaxıya hələ mart ayının ortalarında 2 min erməni əsgərinin və 60 maşına yüklənmiş silah-sursatın göndərilməsi buradakı qırğına əvvəlcədən hazırlıq görülməsinin sübutudur.

Quba qəzasında da qanlı hadisələr eyni tərzdə cərəyan etmiş, erməni hərbi dəstələri 122 kəndi yandırmış, günahsız insanları, o cümlədən qadınları və uşaqları qətlə yetirmişlər. Lənkəran qəzasında 40-a yaxın kənd dağıdılmış, günahsız insanlar öldürülmüş, neçə-neçə ev talan edilib yandırılmışdır.

**(Davamı səh. 8-də)**

# "Türk odası"nın yaradılmasının 15 illiyinə həsr olunmuş tədbir

Aprelin 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Türk odası"nın yaradılmasının 15 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Türkiyə Respublikasının Azərbaycandakı fövqaladə və səlahiyyətli səfiri Erkan Özoral, universitetin fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər. Tədbirdən öncə ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbir iştirakçıları ilə görüşüb. Görüşdə Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, Türk araşdırmaları elmi-tədqiqat mərkəzinin elmi rəhbəri, professor Elman Quliyev iştirak ediblər.

Görüşdən sonra tədbir iştirakçıları "Türk odası"nı, Türk araşdırmaları elmi-tədqiqat mərkəzini, TÜRKSOY kafedrasını ziyarət ediblər. Sonra tədbir universitetin Heydər Əliyev məktəbinin lektoriyasında davam edib.

Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, bu gün universitetimizin həyatında gözəl bir gündür. Biz "Türk odası"nın yaradılmasının 15 illiyinə həsr olunmuş tədbir keçiririk. Türkiyənin Azərbaycandakı fövqaladə və səlahiyyətli səfiri Erkan Özoral ADPU-ya Türkiyə ilə təhsil sahəsində əlaqələrin genişləndirilməsinə yüksək səviyyədə dəstək verir. Bu dəstək həmçinin "Türk odası"nın fəaliyyətində də öz əksini tapır. ADPU-ya yüksək səviyyədə dəstək verdiyinə görə səfir Erkan Özorala təşəkkür edən rektor universitetin Türkiyə universitetləri ilə əlaqələrinin daha da genişlənməsindən məmnunluq duyduğunu bildirib.

"Türk odası"nın yaranma tarixi, fəaliyyət istiqamətləri barədə geniş məlumat verən rektor bildirib ki, 2004-cü ildə ADPU-da Türkiyə səfirliyi tərəfindən "Türk odası" yaradılıb. "Türk odası" ADPU-nun fəaliyyəti dövründə universitetdə yaradılmış ilk beynəlxalq qurumdur. "Türk odası"nın yaradılmasını zəruri edən başlıca səbəb, ilk növbədə, ADPU-da müstəqillik dövründə Türk xalqları ədəbiyyatı və mədəniyyətinin geniş şəkildə araşdırılması, tədrisi və təbliği sahəsində əldə olunmuş nailiyyətlərlə bağlıdır. Belə ki, 1996-cı ildən sonra Azərbaycan universitetlərinin Filologiya fakültələrində tədris planlarına yeni salınmış "Türk xalqları ədəbiyyatı" fənninin tədris proqramı, dərs vəsaiti və dərsliklərinin yazılmasında ADPU-nun göstərdiyi nəticələr digər universitetlərlə müqayisədə daha yüksək olmuşdur. Qürur hissi ilə qeyd etmək lazımdır ki, ADPU o zaman Türk dünyası ədəbiyyatı və mədəniyyəti problemlərinin araşdırılmasında elmi bir mərkəzə çevrilmişdir. Hazırda olduğu kimi, həmin dövrlərdə də əksər universitetlərdə "Türk xalqları ədəbiyyatı" fənninin tədrisi ADPU-nun tədris proqramı, dərs vəsaiti və dərsliklərinə uyğun aparılırdı. Təbii ki, daha böyük uğurlar qazanmaq üçün Türk xalqları ədəbiyyatı, geniş mənada isə Türk mədəniyyətinin təbliği ilə bağlı universitetdə yeni bir qurumun yaranmasına ehtiyac var idi. Bu məqsədlə professor Elman Quliyev tərəfindən ADPU-da "Türk odası" adlı bir qurumun yaradılması üçün Türkiyənin Azərbaycandakı o zamankı səfiri Əhməd Ünal Çeviközə edilmiş müraciət nəticəsiz qalmadı. Qısa zaman ərzində ADPU-da Türkiyə səfirliyi tərəfindən yaradılan "Türk odası" fəaliyyətə başladı. Qeyd edək ki, odanın bütün maddi-texniki təchizatı Türkiyə səfirliyi tərəfindən təmin edildi. "Türk odası"nın fəaliyyət proqramı hazırlanarkən Türkçülüyün təbliği, Türkiyə türk ədəbiyyatının təbliği, Türkiyə mədəniyyətinin təbliği, Türk dünyası ədəbiyyatı və mədəniyyətinin təbliği istiqamətləri hədəf kimi planlaşdırıldı.





Rektor vurğulayıb ki, "Türk odası"nın fəaliyyətinin səmərəsini artırmaq üçün, ilk növbədə, türkdilli dövlətlərin bir sıra elmi-mədəni qurumları, universitetləri, ictimai birlikləri və s. ilə əlaqələr quruldu. Bu gün "Türk odası" Türkiyənin Hacettəpə, Uludağ, Orxon Qazi, Mehmed Akif Ersoy, İstanbul Fen-Edebiyat, Ege və s. kimi nüfuzlu universitetləri ilə sıx əlaqədədir. Eyni zamanda Türk Ocaqlar Birliyi, Türk Dil Qurumu, TÜRKSOY, Türk Əməkdaşlıq və Koordinasiya Agentliyi (TİKA) ilə yaradılmış əlaqələr "Türk odası"nın qarşıya qoyduğu məqsədlərə çatmasına böyük yardım edir. Həmin qurumlar tərəfindən təşkil olunmuş beynəlxalq konfranslara "Türk odası"nın dəvət edilməsi həm odanın, həm də universitetimizin yeni imic qazanmasına, beynəlxalq nüfuzunun artmasına və beynəlxalq aləmdə tanınmasına mühüm təsir göstərib. Türkiyə, Şimali Kipr, Türkmənistan, Qırğızıstan, Qazaxıstan və başqa türk dövlətlərində təşkil olunmuş elmi-kütləvi tədbirlərdə "Türk odası"nın mütəmadi şəkildə iştirakı həmin ölkələrdə bu quruma olan diqqət və marağı artırıb. Artıq "Türk odası" bu ölkələrdə elmi və mədəni qurum kimi tanınır. Türkiyə səfirliyinin və TİKA-nın "Türk odası"na xüsusi qayğısı vardır. Belə ki, 2004, 2007 və 2016-cı illərdə Türkiyə səfirliyinin və TİKA-nın birgə təşəbbüsü ilə "Türk odası"nın texniki avadanlıqlarla təchiz edilməsi hər iki qurumun, bütünlükdə isə Türkiyə dövlətinin ADPU-ya və onun nəzdində fəaliyyət göstərən "Türk odası"na olan diqqət və marağın təzahürüdür. "Türk odası"nda zəngin kitabxana yaradılıb. Türkiyənin Azərbaycandakı səfirliyinin, Türkiyənin Mədəniyyət Nazirliyinin və TİKA-nın birgə layihələri əsasında 2004-cü ildə 1000, 2007-ci ildə 500, 2018-ci ildə 350 kitabın "Türk odası"na pulsuz hədiyyə edilməsi "Türk odası" kitabxanasının zənginləşməsinə səbəb olub. "Türk odası" həmin kitabların daha geniş istifadəsini təmin etmək məqsədilə kitabların böyük əksəriyyətini ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinə təqdim edib. "Türk odası" ADPU-da təhsil alan türkiyəli tələbələrlə də yaxından əlaqə saxlayır, bir sıra tədbirlərin keçirilməsində türkiyəli tələbələrlə birgə iş aparır.

Türkiyənin Azərbaycandakı fövqaladə və səlahiyyətli səfiri Erkan Özoral çıxışında tədbirdə iştirak etməsindən sevinc və qürur



duyduğunu bildirib. Qeyd edib ki, Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra Türkiyə ilə bütün sahələrdə geniş əlaqələr qurub. Bu əlaqələr elm, təhsil və mədəniyyət sahəsində daha sürətlə inkişaf edib. Böyük Mustafa Kamal Atatürk "Azərbaycanın sevinci sevincimiz, kədəri kədərimizdir" deyib. Ulu öndər Heydər Əliyev isə "Biz bir millət, iki dövlətik"söyləyib.ADPU-da "Türk odası"nın fəaliyyət göstərməsi çox təqdirəlayiqdir. Bizim belə qurumlara ehtiyacımız var. Belə qurumlar bizim elm, təhsil və mədəniyyət sahəsindəki əlaqələrimizə böyük dəstək verir.

Tədbirdə "Türk odası" ilə bağlı slayd təqdim edilib.

Professor E.Quliyev "Türk odası"nın fəaliyyətinə göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə və səfir Erkan Özorala təşəkkür edib. "Türk odası"nın 15 ildəki fəaliyyəti haqqında hesabat məruzəsi ilə çıxış edən professor E.Quliyevin hesabat məruzəsində "Türk odası"nın həyata keçirdiyi elmi-mədəni tədbirlər, görüşlər, qurduğu əlaqələr öz geniş əksini tapıb. "Türk odası"nın perspektivlərindən danışarkən professor E.Quliyev qeyd edib ki, biz daha böyük uğurlar qazanmaq naminə yeni layihələr üzərində işləyirik. Ümidvarıq ki, "Türk odası" bundan sonra da səmərəli fəaliyyəti ilə seçiləcək və doğma universitetimizə şöhrət gətirəcəkdir.

**Nurlan İftixaroğlu**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində adlı təqaüdlərə layiq görülmüş tələbələr və onların valideynləri ilə görüş

Aprelin 26-da Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində Heydər Əliyev adına təqaüdə layiq görülmüş "Korreksiyaedici təlim" ixtisasının III tədris ilinin 309-cu qrup tələbəsi Günay Qəribova, Abdulla Şaiq adına təqaüdə layiq görülmüş "Təhsildə sosial-psixoloji xidmət" ixtisasının III tədris ilinin 313-cü qrup tələbəsi Leyla Kərimova və onların valideynləri ilə fakültə əməkdaşlarının görüşü keçirilib.



Görüşü giriş sözü ilə açan fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva qonaqları və görüş iştirakçılarını salamlayıb. Adlı təqaüdlərə layiq görülmüş tələbələrləri təbrik edərək onlarla fəxr etdiklərini bildirib. Son illər ADPU-da yaradılmış şəffaf və obyektiv mühitin nəticəsi kimi bu nailiyyətlərin əldə olunmasını qeyd edib.

Sonra tələbələrin valideynləri çıxış edərək ADPU-nun rəhbərliyinə öz minnətdarlıqlarını bildiriblər. Professor Ramiz Əliyev, professor Müseyib İlyasov, dosent Səbinə Aslanova, müəllim Xalidə Həmidova və başqaları çıxış edərək tələbələri təbrik ediblər və onlarla qürür duyduqlarını bildiriblər.

Fakültə tələbələrinin görüşünə gəlmiş şair Mürvət Qəşəmoğlu onların şərəfinə elə oradaca yazdığı şeirini oxuyub. İştirakçılar görüşdən böyük məmnunluqla ayrılıblar.

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunmuş bədii yaradıcılıq müsabiqə-festivalının baxış mərhələsi

Mayın 10-da müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü tamam olur. Ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü münasibətilə və Onun xatirəsinə ehtiram əlaməti olaraq respublikamızın ali və orta ixtisas təhsili müəssisələrinin tələbələri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bədii yaradıcılıq festivalı Təhsil Nazirliyi (TN) və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİRK) birgə müvafiq qərarı əsasında keçirilir. Bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbə-gəncləri milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək, onların bədii-estetik səviyyəsini yüksəltmək, mədəni həyat tərzinin formalaşdırılması işinə kömək etmək, həmçinin incəsənət və mədəniyyətimizin ayrı-ayrı sahələri üzrə istedadlı gənclərin üzə çıxarılaraq onların qabiliyyətlərinin inkişaf etdirilməsinə dəstək verməkdir.





Festivalın keçirilməsi üçün Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi Münsiflər Heyəti yaradılıb.

Aprelin 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) universitetin tələbələrinin iştirakı ilə bədii yaradıcılıq müsabiqə-festivalının baxış mərhələsi keçirilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin rektoru, professor Ceyran Mahmudova, ADPU-nun İnzibati və iqtisadi işləri üzrə prorektoru Ümid Mehdiyev, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vurğun Məmmədov, Əməkdar incəsənət xadimi Baba Vəziroğlu, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli, Əməkdar artist Təyyar Bayramov tələbələrin çıxışlarını dinləyiblər. Festivalın baxış-mərhələsində ADPU-nun tələbə-gənclərinin yüksək səviyyədə ifa etdikləri rəngarəng şeir, musiqi və rəqs nömrələri diqqəti cəlb edib. Məlumat üçün bildirək ki, festival qaliblərinin yekun konsertinin may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qeyd edək ki, qaliblər TN-nin və ATİAHİRK-nın diplom və hədiyyələri, mükafatları ilə təltif ediləcəklər.

# Səma da sevinərmiş...

Aprelin 3-də Yeni Azərbaycan Partiyasının Səbail rayon təşkilatının təşəbbüsü və dəstəyi ilə bir qrup ziyalı, tələbələr, o cümlədən Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru Himalay Qasımov, dosentləri Sultanəli Qurbanov və bu yazının müəllifi 2016-cı ilin Aprel döyüşlərində Azərbaycan torpaqlarının bütövlüyü uğrunda erməni silahlı dəstələrinə qarşı mətanətlə döyüşərək uğurla irəliləyən və şəhid olan Vətən oğullarının şərəfinə ucaldılmış abidəni ziyarət etmək üçün Horadiz şəhərinə yollanıblar.



Yol boyu ölkə rəhbərliyinin diqqət və qayğısı nəticəsində çəkilmiş abad yolları, yol boyu zövqlə və sıra ilə əkilmiş ağacları, şəhərdə tikilmiş böyük tibb mərkəzini, dağıdılmış, xarabalığa çevrilmiş evlərin yerində ucaldılmış yeni tikililəri gördükcə ürəyimiz iftixarla doldu. Yol uzunu bir-bir kəndləri keçdikcə hiss etdim ki, Vətənimə, xalqıma qarşı dəfələrlə soyqırımı törədən ermənilər yanılırlar. Biz heç vaxt düşmən qarşısında əyiləsi, ruhdan düşəsi, geri çəkiləsi deyilik. Biz harada olsaq, orada həyat var, yaşayış var, Vətən var, sabaha inam var, aydın səma var!

Yol boyu gördük ki, hər yerdə həyat qaynayır - qoyunu örüşə aparan kim, bağ-bağçanı belləyən kim, toxum səpən kim, ağac əkən kim... Bir sözlə, hara baxırdıqsa, insanların ruhla işlədiyini görürdük.

Əvvəlcə Aprel döyüşlərində şəhid olan Vətən oğullarının abidəsi önünə gül dəstələri qoyduq, onları bir dəqiqəlik sükutla yad etdik. Amma göz yaşlarımızı, ürəyimizdəki qəhəri boğa bilmədik. Bu abidə sanki canlı bir sərkərdəyə dönüb bizi intiqama, qisasa səsləyirdi, bədnam qonşularımıza qarşı bizdə nifrəti daha da artırırdı. Elə bir vaxtda abidənin önündə dayanmışdıq ki, səma aydın və ləkəsiz idi. Günəş adamı yandırırdı - sanki bu gənclərin ürəyindən qopan Vətən eşqi atəşə dönüb aləmə əbədi nur çiləyən günəşə dönmüşdü. Bu günəş gec-tez aydın sabahın, yəni murdar erməni ayaqlarının torpağımızdan kəsilib atılacağından xəbər verirdi, qələbə gününün mütləq gələcəyini qətiyyətlə vəd edirdi. Səma da sanki bizim gəlişimizə sevinirdi...

Biz abidənin önündə bu qəhrəmanların şərəfinə ehtiram əlaməti olaraq ağaç tingləri də basdırdıq.

Sonra Cocuq Mərcanlı kəndinə yollandıq. Buradakı gözəl və yaraşıqlı evlər, rahat yollar, göz işlədikcə uzanan zəmilər, insan əli ilə gözəlləşən yaşıl ormanlar, yeni tikilmiş məscid, məktəb binası, gözəl və yaraşıqlı park, yeni elektron tədris vəsaitləri ilə təmin olunmuş sinifləri olan məktəb binası insanı heyran edirdi.

Azərbaycan bayrağı bu gün Aprel şəhidlərinin cəsarəti nəticəsində Cocuq Mərcanlıda vüqarla dalğalanır.

Biz böyük bir əminliklə dərk etdik və inandıq ki, bir xalq, bir millət kimi aciz deyilik. Torpaqlarımızın geriyə qaytarılması üçün gücümüz, qüvvəmiz, namus və qeyrətimiz, mübarizə əzmimiz var.

Sonra Cocuq Mərcanlı kəndindəki məktəbə getdik. Başda professor Himalay Qasımov olmaqla, məktəbə 300 kitab hədiyyə etdik. Məktəb rəhbərliyi, şagirdlər və ictimaiyyətin nümayəndələri bizi çox sevinclə, məmnunluqla, ehtiramla qarşıladılar. Həmin məktəbin şagirdləri Aprel döyüşlərində şəhid olmuş igidlərin xatirəsinə həsr olunmuş anım tədbiri keçirirdilər. Tədbirdə uşaqların yanıqlı ahla, böyük iftixarla dediyi şeirlər məni kövrəltdi. Məni ağlamaq tutdu, göz yaşlarımı gizlədə bilmədim. Şəhid qardaşım bir anlıq gözümün qarşısında canlandı. Elə hiss etdim ki, qardaşım da bu gənclərin arasından mənə baxıb gülümsəyir, gəlişimizə sevinir... Axı o da Şəhidlər xiyabanında uyuyur. Qardaşım Eldəniz Aslan oğlu Novruzov Qarabağ uğrunda döyüşlərdə şəhid olub. Qəlbim, ürəyim qürur hissi ilə doldu. Fikirləşdim, yaxşı ki, bizim bu cür igidlərimiz olub və var. Çünki "Şəhidi olmayan torpaq müstəmləkədir", "Torpaq uğrunda ölən varsa, Vətəndir" deyirlər.

Sonra biz Müdafiə Nazirliyinin "N" hərbi hissəsində olduq, əsgərlərin yaşayış şəraiti ilə tanış olduq. Sovet dövrü ilə müqayisədə bugünkü yaşayış tərzinin üstünlüklərini gözümüzlə gördük, əsgərlərlə birlikdə yeməyə oturduq. Onlarla söhbət etdik. Hər bir əsgərdəki ruh yüksəkliyini, döyüşə hazır olduqlarını, ürəklərinin qələbəyə inam hissi ilə döyündüyünün şahidi olduq. Onlarla xudahafizləşib Füzuli rayonunun ermənilərlə təmas xəttində yerləşən Alxanlı kəndinə getdik. Orada erməni vəhşiliklərinin qurbanı olmuş 2 yaşlı Zəhra və onun nənəsi Sahibə Allahverdiyevanın abidəsi önünə gül dəstələri qoyduq.

Bu səfərdən qələbəyə inam hissi ilə döndük. Biz inandıq ki, tezliklə torpaqlarımız işğaldan azad olunacaq, Cocuq Mərcanlıdakı şərait Azərbaycanımızın itirilmiş bütün kənd və şəhərlərində yaradılacaq. Xalqımızın böyük ruh yüksəkliyi ilə etimad göstərib Prezident seçdiyi İlham Əliyev və onun rəhbərlik etdiyi Azərbaycan xalqı söndürülmüş ocaqların yenidən yandırılmasını reallaşdıracaq, üçrəngli bayrağımızı bütün bölgələrdə dalğalandıracaq.

**Nazəni Novruzova,
ADPU-nun dosenti**

# “Vətən sənə oğul dedi...” adlı tədbir



Aprelin 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzinin təşəbbüsü və təşkilatçılığı ilə Vətənimizin müstəqilliyi və ərazi bütövlüyü uğrunda qəhrəmancasına həlak olmuş, Azərbaycanın Milli Qəhrəmanı Təbriz Xəlil Rza oğlu Xəlilbəylinin xatirəsinə həsr olunmuş “Vətən sənə oğul dedi...” adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşları, Təbriz Xəlilbəylinin anası Firəngiz Xəlilbəyli, qızı Gültac Xəlilbəyli, qohumu, “Yuğ” Teatrının aktyoru Kamran Yunus, müəllim və tələbələr iştirak ediblər. Tədbirdə öncə Azərbaycanın ərazi bütövlüyü və müstəqilliyi uğrunda qəhrəmancasına həlak olmuş şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbiri giriş sözü ilə açan Kitabxana-İnformasiya Mərkəzinin direktoru vəzifəsini icra edən Zinharə Həsənova bildirib ki, dövlətimiz hər zaman şəhid ailələrinə, milli qəhrəmanlara, Qarabağ müharibəsi iştirakçılarına, məcburi köçkün soydaşlarımıza xüsusi diqqət və qayğı göstərir. Yanvarın 29-da Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və Birinci vitse-prezident Mehriban xanım Əliyevanın şəhid ailələri ilə görüşməsi bunun bariz nümunəsidir. Xalqımızın qəhrəman oğlu Təbriz Xəlilbəyli Xalq şairi Xəlil Rza Ulutürkün ailəsində dünyaya göz açmışdı. Xəlil Rza Ulutürk əsl azadlıq carçısı idi. Belə bir azadlıq şairinin ailəsində böyüyən Təbriz Xəlilbəyli təbii ki, belə mübariz olmalı idi. 1991-ci ilin sonlarında könüllü olaraq cəbhəyə yola düşən Təbriz Xəlilbəyli qısa müddət ərzində döyüşçü yoldaşları arasında böyük nüfuz və hörmət qazanmışdı. İgid və cəsur bir döyüşçü kimi tanınan Təbriz Xəlilbəyli döyüşlərdə dəfələrlə qəhrəmanlıq göstərmiş, yaralı əsgər və zabitlərimizi atəş altından çıxarmış, düşmənin xeyli canlı qüvvəsini məhv etmişdi. O, 1992-ci il yanvar ayının 31-də Daşaltı əməliyyatı zamanı qəhrəmancasına həlak olmuşdur.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxışında qeyd edib ki, dünyada 6 minə yaxın xalq, 200 dövlət var. Azərbaycan xalqı xoşbəxt xalqdır ki, müstəqil dövləti var. Bu gün Azərbaycanın dünyanın 70-dən çox ölkəsində diplomatik nümayəndəlikləri fəaliyyət göstərir. Azərbaycanın müstəqillik qazanmasında xalqımızın Xəlil Rza Ulutürk, Təbir Xəlilbəyli kimi vətənpərvər oğullarının mühüm xidmətləri var. Vətənpərlik, millətsevərlik insanın daxilindən gəlir. Xəlil Rza Ulutürk milli-azadlıq hərəkatının gedişində öz alovlu çıxışları ilə xalqımızın mübarizə ruhunu daha da yüksəldirdi. Xalqımızın azadlığı uğrunda apardığı qətiyyətli və prinspial mübarizəyə görə Xəlil Rza Ulutürk həbs edilsə də, o, əyilmədi, sınmadı, yenilməz iradə və qətiyyət nümayiş etdirdi. Təbriz Xəlilbəyli Xəlil Rza Ulutürkün layiqli övladıdır. Qısa ömür yaşasa da, xalq, Vətən üçün böyük işlər gördü. Təbriz Xəlilbəylinin əziz xatirəsi qədirbilən xalqımızın qəlbində əbədi yaşayacaq.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, dosent Razim Məmmədov çıxışlarında tələbə-gənclərə Xəlil Rza Ulutürk və Təbriz Xəlilbəyli kimi vətənpərvər olmağı tövsiyə ediblər.

Tədbirdə Azərbaycanın Milli Qəhrəmanı Təbriz Xəlilbəyli haqqında video təqdimatı olub, Filologiya fakültəsinin II tədris ili tələbəsi Aytac Əliyeva Xəlil Rza Ulutürkün “Oğlum Təbrizə” şeirini, I tədris ili tələbəsi Leyla Uquzova isə “Azərbaycanın Milli Qəhrəmanı” şeirini səsləndiriblər.

Təbriz Xəlilbəylinin anası Firəngiz Xəlilbəyli və Kamran Yunus çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə və bu işdə əməyi keçən hər kəsə təşəkkür ediblər.

# Mary Diane Whaley yenidən ADPU-da fəaliyyətə başladı



ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi “İngilis dili mütəxəssisi” (English Language Specialist) təqaüd proqramı çərçivəsində İngilis dili üzrə mütəxəssis Mary Diane Whaley aprelin 1-də yenidən ADPU-da fəaliyyətə başlamışdır. Ekspertin 3 ay (aprel-iyun aylarında) müddətində fəaliyyət göstərəcəyi planlaşdırılmışdır. Bu müddət ərzində mütəxəssisin ingilis dilinin tədrisi səviyyəsinin artırılması məqsədilə bir sıra işlərə cəlbi, bu istiqamətdə aidiyyəti struktur rəhbərləri ilə görüşlərinin keçirilməsi, daha əvvəlki gəlişi zamanı bir qrup müəllim heyəti ilə birlikdə hazırladığı “İngilis dili müəlimliyi” ixtisasının yeni tədris planı layihəsi üzrə müəllimlərə təlimlərinin təşkili nəzərdə tutulmuşdur. Bu məqsədlə ekspertin aprelin 4-də Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva və bir sıra ingilis dili müəllimləri ilə görüşü keçirildi. Görüşdə ekspert təlimlərdə iştirakın könüllülük prinsipi əsasında olduğunu, seçilmiş müəllimlərin dərslərində iştirak edərək təlim zamanı öyrəndiklərinin dərsdə tətbiq etmələrini müşahidə edəcəyini bildirdi, eyni zamanda uğurlu nəticə əldə edən müəllimlərin təlimçi kimi hazırlanacağını qeyd etdi.

Universitetdə tədrisin keyfiyyətin artırılmasında xarici təcrübənin vacibliyini vurğulayan fakültə dekanı, professor Mahirə Hüseynova bu tip təlimlərin müəllimlərin peşəkarlığı baxımından əhəmiyyətinə toxundu və təlimlərin uğurlu nəticə əldə etməsi üçün hər cür dəstək göstərəcəyini söylədi.

Məlumat üçün qeyd edək ki, ekspert “İngilis dili müəllimliyi” ixstisasının yeni tədris planının hazırlanması məqsədilə ötən ilin noyabr-dekabr aylarında ADPU-ya dəvət olunmuşdur. Fəaliyyəti müddətində mütəxəssis universitetin aidiyyəti struktur rəhbərləri ilə görüşmüş, sillabusarın tərtibi mövzusunda professor-müəllim heyətinə təlimlər keçmiş, seçilmiş bir qrup ingilis dili müəllimi ilə birlikdə qeyd edilən ixtisasın yeni tədris planı layihəsi üzərində işləmişdir.

# Beynəlxalq nəşriyyat ADPU-nun professorunun kitabını nəşr etdi




Bu günlərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının professoru, Türk araşdırmaları elmi-tədqiqat mərkəzinin elmi rəhbəri, professor Elman Quliyevin “Türk xalqları ədəbiyyatı” dərsliyi dünyanın ən nüfuzlu nəşriyyatı və yayım təşkilatı olan “LAMBERT Academic Publishing” tərəfindən çap olunmuşdur. Professor E.Quliyev uzun illərdir ki, Türk və Şərq dünyası ədiblərinin həyat və yaradıcılığının araşdırılması ilə məşğuldur. Belə ki, müxtəlif illərdə professor E.Quliyevin “M.Şəhriyar: Gəldim sizi görməyə” (Bakı, 1992), “S. Tahir. Lirika” (Bakı, 1992), “M. Şəhriyar. Heydərbabaya salam” (Bakı, 2004),“Türk xalqları ədəbiyyatı” (Bakı, 1998), “Şərq xalqları ədəbiyyatı” (Bakı, 1998), “Ümumtürk ədəbiyyatı” (Bakı, 2005), “Qədim türk ədəbiyyatı” (Bakı, 2010), “Mirzə İbrahimov: Ədəbi-estetik görüşlər və sənətkarlıq məsələləri” (Bakı, 1997), “Seyid Məhəmmədhüseyn Şəhriyar” (Bakı, 1999), “Müasir Özbək ədəbiyyatı tarixi” (Bakı, 1999), “Heydərbabaya salam” necə varsa” (Bakı, 2001), “Türkiyə türk ədəbiyyatı” (Bakı, 2003), “Şəhriyar poeziyası və milli təkamül” (Bakı, 2004), “Şəhriyar poetikası” (Bakı, 2006, birgə müəlliflə), “Özbək ədəbiyyatı” (Bakı, 2009), “Türk xalqları ədəbiyyatının yaradıcılıq problemləri” (Bakı, 2010, birgə müəlliflərlə), “Orta əsrlər türk xalqları ədəbiyyatı” (Bakı, 2010), “Türk xalqları ədəbiyyatı” (Bakı, 2009; 2011), “Şərq xalqları ədəbiyyatı”, 2 cilddə, (Bakı, 2011), “Qədim və orta əsrlər türk xalqları ədəbiyyat” (Bakı, 2012), “Türk xalqları ədəbiyyatı” (Bakı, 2017) və s. kitabları işıq üzü görmüşdür.Məlumdur ki, müstəqillik illərindən başlayaraq, türkologiya sahəsi yeni istiqamətdə inkişaf etməyə başladı. Bu sahənin bünövrəsini qoyanlar sırasında professor E.Quliyevin özünəməxsus yeri var. Professor E.Quliyev ilk dəfə olaraq ali məktəblər üçün türk xalqları ədəbiyyatının tədrisi ilə bağlı proqram hazırlamış və vahid bir dərslik ərsəyə gətirmişdir. Bu gün bütün ali məktəblər professor E.Quliyevin müəllifi olduğu “Türk xalqları ədəbiyyatı” dərsliyindən bəhrələnməkdədir. Bununla yanaşı, professor E.Quliyev türkologiya sahəsində bir sıra xidmətlər göstərmiş, neçə-neçə türkoloqun yetişməsi naminə əlindən gələni əsirgəməmişdir. Professor E.Quliyev göstərdiyi xidmətlərə görə dövlət və beynəlxalq təşkilatların bir sıra mükafatlarına layiq görülmüşdür.

Çağdaş türkologiyaya dəyərli bir töhfə verən professor E. Quliyevin “Türk xalqları ədəbiyyatı” dərsliyi özündə bir sıra mühüm nəzəri və elmi mülahizələri əks etdirən yüksək səviyyəli bir kitabdır. Dərsliyin beynəlxalq nəşriyyat tərəfindən çap olunaraq beynəlxalq miqyasda yayılması isə olduqca təqdirəlayiq haldır.

“Türk xalqları ədəbiyyatı” dərsliyi müəllifin ən dəyərli kitabları sırasında yer almaqdadır. Belə ki, Turan dünyasının ədibləri haqqında araşdırmaların, məlumatların yer aldığı bu dərslik Azərbaycanda olduğu kimi, dünya miqyası üçün də dəyərli bir elmi mənbə və bilik xəzinəsidir. “Türk xalqları ədəbiyyatı” dərsliyi gərgin əməyin və zəhmətin məhsuludur. Çünki burada ən qədim türk dastanlarından başlayaraq çağdaş dövrədək özbək, türk, qazax, qırğız, tatar, türkmən və s. xalqların şair və yazarlarının həyatı, eləcə də yaradıcılığı yer almaqdadır. Hər bir xalqın ədəbiyyatı haqqında dolğun təəssürat yaradan bu dərsliyin elmi dəyəri olduqca yüksəkdir. 2017-ci ildə Azərbaycan Respublikası Təhsil Nazirliyinin qrifi ilə Bakıda nəşr olunan bu kitab bu gün türk dünyasının bir çox ali məktəblərində kifayət qədər tanınan və tələbat yaranan kitablar cərgəsində yer alır. Dərsliyin elmi redaktoru professor Himalay Qasımov, rəyçiləri isə akademik İsa Həbibbəyli, akademik Gövhər Baxşəliyeva, akademik Nizami Cəfərov, professor Qəzənfər Paşayev, professor Əsgər Rəsulov, professor Nizami Tağısoy kimi ziyalılarımızdır. Belə ziyalı insanların kitaba rəy verməri dərsliyin elmi sanbalından, dəyərindən xəbər verən mühüm məqamdır.

Daha öncə qeyd etdiyimiz kimi, professor E.Quliyevin “Türk xalqları ədəbiyyatı” dərsliyinə artıq dünya miqyasında tələbat yaranmışdır. Bu tələbatı nəzərə alan “LAMBERT Academic Publishing” nəşriyyatı kitabı çap edərək dünya miqyasında yaymağa başlamışdır. Belə ki, adıçəkilən nəşriyyat professor E. Quliyevin “Türk xalqları ədəbiyyatı” kitabını nəşr etdikdən sonra Amerika və Avropada, ümumən dünya miqyasında tanıtmağı və yaymağı nəzərdə tutur. Qeyd edək ki, kitab İSBN 978-613-9-45859-2 beynəlxalq kodu ilə çap olunmuşdur. Professor Elman Quliyevin müəllifi olduğu “Türk xalqları ədəbiyyatı” dərsliyinin dünya ölkələrinin ali məktəblərində və kitabxanalarında yer alması həm də Azərbaycan elminin uğurundan xəbər verir.

Biz də Elman müəllimi bu münasibətlə təbrik edir və yeni-yeni elmi uğurlar arzulayırıq.

# Azərbaycanlıların soyqırımı: tarixi gerçəklik

(Əvvəli səh. 6.da)

On minlərlə insanın qətlə yetirilməsinin sübutu kimi və onların xatirəsinə ehtiram əlaməti olaraq Quba Soyqırımı Memorial Kompleksi yaradılmış və ölkəmizin əhalisi, həmçinin xarici qonaqlar tərəfindən bu kompleks ziyarət olunur. Beynəlxalq hüquqa görə, soyqırımı ən ağır beynəlxalq cinayət olmaqla, insanlıq əleyhinə yönələn təcavüz, terrorçuluq kimi cinayətlər qrupuna aid edilir. Soyqırımı cinayətinin əlamətləri Birləşmiş Millətlər Təşkilatının (BMT) Baş Məclisinin 9 dekabr 1948-ci il tarixli 260 nömrəli qətnaməsi ilə qəbul edilmiş “Genosid cinayətinin qarşısının alınması və cəzalandırılması haqqında” Konvensiyada müəyyən olunmuşdur. Konvensiyaya görə , soyqırımı hər hansı milli, etnik, irqi, yaxud dini qrupu tam və ya qismən məhv etmək məqsədilə törədilən hərəkətlərdir. İnsanlıq əleyhinə cinayətin tərkibini təşkil edən və bu sənəddə göstərilən əməllərdən hər biri 1918-ci ilin Mart hadisələri zamanı ermənilər tərəfindən azərbaycanlılara qarşı törədilmişdir və hüquqi baxımdan soyqırımı kimi qiymətləndirilməlidir.

Tarix göstərmişdir ki, erməni millətçiləri əl çəkməmiş, dinc soydaşlarımızı qəddar üsullarla kütləvi qırğına məruz qoyaraq cinatətlərini ört-basdır etmək üçün müxtəlif vasitələrlə hadisələri saxtalaşdırmağa və öz xeyirlərinə yazmağa əl atmışlar.

Ermənistan 1988-ci ildən başladığı növbəti təcavüz siyasəti nəticəsində Azərbaycanın ayrılmaz tərkib hissəsi olan Dağlıq Qarabağ ərazisini, eləcə də 7 ətraf rayonu işğal etmiş, beləliklə, ölkəmizin 20 faiz ərazisi zəbt edilmiş, 1 milyon soydaşımız qaçqın və məcburi köçkün vəziyyətinə düşmüş, onların hüquqları kütləvi şəkildə kobudcasına pozulmuşdur. Bu işğal zamanı da erməni millətçiləri və terrorçuları Azərbaycanın Xocalı şəhərində, Kərkicahan, Malıbəyli, Quşçular, Qaradağlı, Ağdaban kəndlərində və digər yaşayış məntəqələrində soyqırımları törətmişlər.

Zəbt olunmuş Dağlıq Qarabağ və ətraf rayonlar Azərbaycan ərazisinin ayrılmaz tərkib hissəsidir. BMT Təhlükəsizlik Şurası ölkəmizin işğal olunmuş torpaqlarının qeyd-şərtsiz azad edilməsi barədə 4 məlum qətnamə, BMT Baş Məclisi “Azərbaycanın işğal olunmuş ərazilərində vəziyyət” adlı 14 mart 2008-ci il tarixli qətnamə, Avropa Şurası Parlament Assambleyası (AŞPA) Azərbaycan ərazilərinin erməni hərbi qüvvələri tərəfindən işğal edildiyini və Dağlıq Qarabağın separatçı qüvvələr tərəfindən idarə olunmasını təsdiq edən 2005-ci il tarixli 1416 nömrəli qətnamə və 1690 nömrəli tövsiyə, həmçinin Avropa Parlamenti Dağlıq Qarabağla bağlı 23 oktyabr 2013-cü ildə qətnamə qəbul etsələr də, Ermənistan bunları hələ də yerinə yetirmir. Halbuki bu qətnamələrdə birmənalı olaraq Ermənistandan öz hərbi qüvvələrini işğal etdiyi Azərbaycan ərazilərindən çıxarması, 1 milyon azərbaycanlı qaçqın və məcburi köçkünün öz doğma torpaqlarına qayıtmasına imkan yaratması tələb olunmuşdur.

Ermənistan AŞ-na üzv qəbul olunarkən Parlament Assambleyasının 221 nömrəli rəyi əsasında öz üzərinə bir sıra öhdəliklər götürmüş, Dağlıq Qarabağ münaqişəsinin yalnız dinc yollarla nizamlamaq üçün səyləri davam etdirmək, beynəlxalq və yerli mübahisələri, qonşulara qarşı hər hansı güc tətbiqinə və hədələməyə yol vermədən dinc vasitələrlə və beynəlxalq hüququn prinsipləri əsasında həll etmək öhdəliyini götürmüşdür. Lakin erməni tərəfi qeyri-konstruktiv mövqe nümayiş etdirərək, bu öhdəliklərə əməl etmir, regionda sülhün bərqərar olunmasına maneçilik törədir, atəşkəs rejimini mütəmadi olaraq pozur.

Belə ki, 2 aprel 2016-cı il tarixdə işğal olunmuş Azərbaycan ərazilərindən və Ermənistan Respublikası ərazilərindən erməni silahlı qüvvələri tərəfindən qəflətən iri miqyasda Azərbaycan Respublikasının əraziləri, cəbhəyanı bölgələrdə məskunlaşan mülki əhalinin yaşadığı çoxsaylı yaşayış məntəqələri, məktəblər və digər sosial obyektlər, habelə Azərbaycan Silahlı Qüvvələrinin qoşunlarının təmas xətti boyunca mövqeləri ağır artilleriyadan, iri çaplı silahlardan intensiv atəşə məruz qalmışdır. Nəticədə dinc əhali, o cümlədən uşaqlar, qadınlar və ahıllar həlak olmuş və ağır yaralanmışlar. Bu təxribatlar nəticəsində beynəlxalq sənədlərin, o cümlədən Cenevrə Konvensiyalarının müddəaları kobud şəkildə pozulmuşdur.

Bütün bunlar XXI əsrdə, yüksək mədəni, iqtisadi inkişaf səviyyəsinə nail olmuş dünya ictimaiyyətinin gözü qarşısında baş verir. Qətiyyətlə bildiririrk ki, hər bir vandalizm, separatçılıq, milliyyətçilik, terrorçuluq aktlarına hüquqi-siyasi qiymət verilmədikcə, bütün bəşəriyyət təhlükə qarşısında qalacaqdır.

Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin sülh yolu ilə həllinə daim səy göstərir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev hər zaman bu münaqişənin yalnız ölkəmizin ərazi bütövlüyü çərçivəsində həllinin, zəbt olunmuş Azərbaycan torpaqlarından işğalçı qüvvələrin çıxarılmasının zəruriliyini qətiyyətlə vurğulayır.

Son dövrlər dünya ictimaiyyəti Azərbaycanın haqlı mövqeyini getdikcə daha çox dəstəkləyir, problemin beynəlxalq hüquq normaları çərçivəsində dinc vasitələrlə həll edilməsində maraqlıdır. Qeyd olunmalıdır ki, ABŞ-ın Nyu-York ştatının Senatı və Nyu-Cersi ştatının Baş Assambleyası 31 Mart-Azərbaycanlıların Soyqırımı gününü tanıyan qətnamələr qəbul etmişlər.

Yeri gəlmişkən, artıq 14 dövlətin parlamentləri ermənilər tərəfindən 26 fevral 1992-ci il tarixdə törədilmiş Xocalı soyqırımını beynəlxalq hüquq normaları müstəvisindən tanımışlar. Habelə ABŞ-ın artıq 21 ştatının qanunverici orqanlarında da müvafiq qətnamələr qəbul olunmuşdur.

Beləliklə, qeyd etməliyik ki, 31 Mart-azərbaycanlıların soyqırımına beynəlxalq miqyasda hələ də hüquqi qiymət verilməmişdir. Dünya birliyinə və mötəbər beynəlxalq qurumlara müraciət edərək, Azərbaycana qarşı aparılan uzunmüddətli erməni təcavüzünə, kütləvi şəkildə insan hüquqlarının pozulmasına son qoyulacağına uzun müddət davam edən bu münaqişənin sülh və danışıqlar yolu ilə aradan qaldırılmasına kömək göstəriləcəyinə tam əminliyimizi ifadə edirik.

Beynəlxalq təşkilatlardan ikili standartlara yol vermədən haqlı mövqeyimizi dəstəkləməyi tələb edir, ədalətin tezliklə öz yerini tapacağına, insanlığa qarşı törədilən bu qatı cinayətin soyqırımı aktı kimi beynəlxalq hüquqi qiymətini alacağına, cinayətkarların cəzasız qalmayacağına, soyqırımı törətmiş Ermənistana qarşı səlahiyyətli beynəlxalq qurumlar tərəfindən sanksiyaların tətbiq olunacağına, Azərbaycanın ərazi bütövlüyünün, 1 milyon qaçqın və məcburi köçkün soydaşımızın kütləvi şəkildə pozulmuş hüquqlarının bərpa ediləcəyinə, əsir və girovların azad olunacağına inanırıq...

Ümüd edirik ki, tolerantlıq məkanı olan Azərbaycan torpaqlarında sülhün və əmin-amanlığın bərqərar edilməsində bütün nüfuzlu beynəlxalq qurumlar, sülhməramlı insanlar imkanlarını səfərbər etməklə səylər göstərəcək, uzun illərdən bəri Azərbaycana qarşı davam edən təcavüz siyasətinə son qoyulacaq.

**Naibə Əhmədova,**
**Azərbaycan tarixi kafedrasının müdiri, dosent**

# Dosent Pəri Paşayevanın 65 illik yubileyi münasibətilə

## Xoş gəldin!



İlahidən bir nizam var fələkdə,
Sən doğuldun, alqışladı mələk də,
Ailədə, əqrəbalı çələngdə
Həm bala, həm nənə, həm ana Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Qorxmadın zirvələr sərinliyindən,
Dərs alıb təfəkkür dərinliyindən,
Ana dilimizin şirinliyindən,
Bal qatdın şeirli dəhana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Sən öz saydığını daim sayansan,
Dilsiz daşları da qəlbən duyansan,
Dost yolunda öz canına qıyansan,
Bu hikmətdən çoxu oyana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Kamalınla elmə ocaq yandıran,
Ziyasını zəkalara qonduran,
Cəngavərsən mərd Tomrisi andıran,
Qan uddur qanlarla doyana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Təlimin, ürfanın sönməz odusan,
Qəlb odunu Prometey odu san,
Qələmini amalının dadı san,
Nifrət yaz Nəsimi soyana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Kindən, küdrətdən,
şərdən uzaqsan,
Təhsilin yolunda
mayaq, çıraqsan,
Xain göz görəndə
iti bıçaqsan,
Dayaq ol, şər gözü
oyana, Pəri,
Xoş gəldin sən
bizim cahana, Pəri!

Dönənsən maarifin zümrüd quşuna,
Bahar gətirənsən elmin qışına,
Zər tacsan idrakın məğrur başına,
Təzim et bu tacı qoyana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Ürfana bağlıdır əhdin, ilqarın,
Başın ucaldıqca əyilir barın,
Qoy davamlı olsun ömür baharın,
Sığmasın şöhrətin məkana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

Altmış beş deyir ki, sarıl qələmə,
Yetmişdə, səksəndə qələm çək qəmə,
Yüzə yetişəndə “Qocaldım!” - demə,
Daha bir qərinə ver cana, Pəri,
Xoş gəldin sən bizim cahana, Pəri!

**Məhərrəm Hüseynov,**
**filologiya üzrə elmlər doktoru**

# Allah rəhmət etsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti **Məmmədxan Soltanovun** vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tarix və coğrafiya fakültəsinin “Sosial iş” ixtisasının 1802-ci qrup tələbəsi **Məhəmməd Qurbanovun** vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1504
Sayı: 1500
Çapa imzalanıb: 30.04.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, “Azərbaycan” Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.